**Kitabın orijinal adı:**
Risalet Davasının Annesi
Hz. Hatice (radiyallah anhə)

**Müəllif:**
Muhammed Emin Yıldırım

**Anadolu türkcəsindən Azərbaycan türkcəsinə uyğunlaşdıran:**
Hacıyev Cavidan

**Bədii redaktor:**
Elşən Rzayev

**Dizayn:**
Nicat Qəribov

**Bakı-2017; İpəkyolu Nəşriyyatı;**
**İSBN: 978-9952-4497-1-6**

Bu kitab Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin 15 mart DK-180/M nömrəli razılıq məktubu ilə nəşr edilmişdir.




İPƏKYOLU NƏŞRİYYATI

Bakı Şəhəri Səbail Rayonu
Cəfərov Qardaşları, 16.
Tel: (+994 12) 492 14 38
Mobil: (+994 51) 412 22 82
Web sayt: www.ipekyolunesriyyati.az
Elektron poçt: ipekyoluneshriyyati@gmail.com

*Səhabə İqlimi*

**1**




İMAN MÜBARİZƏSİNİN ANASI

# Hz. Xədicə

(*Radiyallahu Anhə*)



Muhammed Emin
YILDIRIM

gənc muslim

﴿خَيْرُ نِسَاءِ الْعَالَمِينَ:

مَرْيَمُ بِنْتُ عِمْرَانَ

وَآسِيَةُ بِنْتُ مُزَاحِمٍ

وَخَدِيجَةُ بِنْتُ خُوَيْلِدٍ

وَفَاطِمَةُ بِنْتُ مُحَمَّدٍ﴾



*"Bütün bəşəriyyət içində ən xeyirli qadınlar bunlardır: İmranın qızı Məryəm, Müzahimin qızı Asiyə, Xuveylidin qızı Xədicə, Muhəmmədin ﷺ qızı Fatimə."*

*(Tirmizi, 3878)*

﴾ ... إِنِّي قَدْ رُزِقْتُ حُبَّهَا ﴿



*“Mən onun (Xədicənin) sevgisi ilə ruziləndirildim.”*

*(Müslim, Kitabul-Fədail, 75)*



## İÇINDƏKİLƏR:

# Ön Söz



Aləmlərin Rəbbi olan Allaha həmd, aləmlərə rəhmət olaraq göndərilən Hz. Peyğəmbərə ﷺ salavat və salam, Peyğəmbər evinin sultanları olan analarımıza və digər mübarək səhabələrə də salam olsun.



"Səhabə iqlimi" silsiləsindən olan əsərlər o gözəl rəhbərlərin tanınması üçün qələmə alınmışdı. Bu silsilənin ilk kitabı Hz. Xədicə anamızdan bəhs edən kitabdır. Əlbəttə, o sətrlərin müəllifi üçün bu, çox böyük bir dəyər ifadə edir. Həmin dəyər budur: əgər səhabədən bəhs ediləcək və tanıdılmağa çalışılacaqsa, bunun üçün ən layiqli ünvan Hz. Xədicə anamız olmalıydı. Çünki o, evin içindən biri idi. Rəsulallahı hər kəsdən çox tanıyırdı. Onun dəyər və qiyməti Allah Rəsulunun yanında başqa idi. Elə buna görə də ilk olaraq ondan bəhs edilməliydi. Allaha şükür ki, belə də oldu...

Bu çalışma Hz. Xədicə anamızın bərəkətilə Anadolu türkcəsində təkrar-təkrar nəşr olundu. İndi isə yeni bir həyəcan bizi sardı. Çünki kitabımız can

qardaşlarımın da dilinə - Azərbaycan türkcəsinə - uyğunlaşdırıldı.

"Peyğəmbərimizi səhabə kimi sevmək" kitabımızdan sonra bu kitabımız da Azərbaycan türkcəsində qardaşlarımın ixtiyarına verildi.

Bu gözəlliyi mənə yaşamaq fürsəti verən başda Cavidan qardaşım olmaqla əməyi keçən bütün dostlarıma dərin təşəkkür edirəm.

Bu kitabımızın Azərbaycandakı qardaşlarıma Hz. Xədicə anamızı daha yaxından tanıdıb sevdirməsinə vəsilə olması üçün də Rəbbimə dua edirəm.

Cəhd etmək bizdən, müvəffəqiyyət isə Rəbbimizdəndir.



***Muhammed Emin Yıldırım***

18 Cəmaziyəlaxır 1438 / 17 Mart 2017

# Təqdimat



Rəsuli-Əkrəmi ﷺ bir günəşə bənzətsək, səhabələr həmin günəşin ətrafında pərvanə kimi fırlanan planetlərə oxşayar. Hər bir planet qabiliyyəti nisbətində həmin günəşdən istifadə edər, bir növ onunla həyat qazanar və onu özündə əks etdirər. Şübhəsiz ki, səhabələr da ətrafında pərvanə olduqları Peyğəmbərimizdən ﷺ müəyyən həcmdə nur və dərin iz daşıyırlar. Biz bu nurları təqib edib və onların ayaq izləri ilə getsək, Peyğəmbərimizin mübarək sözləri ilə buyurduğu müjdəyə nail olar, doğru yolun nizamlı yolçularından olarıq.

Bu uca şəxsiyyətləri dərk etməyə çalışarkən, hər zaman belə bir metodu rəhbər tutduq: Bu şəxsiyyətlər, peyğəmbər dəzgahında cilalanmış insanlardır. Bu şəxsiyyətlər, nübuvvət mədrəsəsinin müəllimi olan Hz. Peyğəmbərin mübarək əlində formalaşmışlar. Belə olduğu təqdirdə isə, bu tələbələr müəllimlərindən daha çox təsirlənmiş olur. Görəsən nübuvvət günəşi hansı səhabədə nə qədər iz buraxmışdır və həmin iz nə idi? Bu sualdan yola çıxaraq, həmin izi axtarmağa başladıq.

Həmin izi tapanda isə işimiz onunla bitmədi. Əsl üzərində duracağımız xüsus ondan sonra başladı. Bu xüsus nədir? Peyğəmbərdən səhabələrə düşən həmin izləri biz necə və hansı metodlarla müasir dövrümüzə gətirə bilər və o abi-həyat iqlimi ilə yenidən həyat qazana bilərik?

Bir sözlə, səhabə iqlimindəki səfərimizin iki əsas məqsədi var. Birincisi, göy üzünün əmin-amanlıq vəsilələri olan və hər biri səmanın bir ulduzu olan, bizi haqqa və hidayətə aparma baxımından rəhbər və imamlarımız olan səhabələri doğru dərk etmək.

İkincisi isə, aramızdakı zaman və məkan sərhədlərinin fərqliliklərinə baxmadan bu gündən o günə pəncərələr açmaq, körpülər qurmaq və o ülvi insanların misilsiz həyatlarının nümunələrini müasir dövrümüzə gətirərək onlarla məna qazanmaq.



Deməli, səhabə iqliminin tələbələri olaraq bizim iki əsas vəzifəmiz var. Bir dərk etmək, digəri isə məna qazanmaq.

Məhz əlinizdəki bu kitab Əsri-Səadət iqliminə etdiyimiz səfər əsnasında onlara məxsus bağçadan bu günümüzə gətirə bildiyimiz ilk meyvədir. İnşallah, bu səfərimiz eyni həssasiyyət və ölçülərlə davam edəcək və sizinlə birlikdə həmin mübarək iqlimin ərsəyə gətirdiyi bir çox şəxsiyyətləri dərk etməyə davam edəcəyik.

"Səhabə iqlimi" əsas başlığı ilə ortaya qoyduğumuz bu silsilə yazılar, əslində bu ad ilə bir neçə il əvvəl keçdiyimiz dərslərdən toplanmışdır. Beləcə bu əsər dostların təkidlərindən sonra istifadə edilsin

deyə yenidən bəzi düzəlişlər edilərək dəyərli oxuculara təqdim edilməkdədir. Buna görə də kitabda bəzən ədəbi dildən çox xitabət dili görüləcəkdir. Hər cür əskik və qüsura baxmayaraq, yolumuzun yeganə rəhbərləri olan səhabələrin az da olsa tanınmasına, sevilməsinə və qoyduqları mirasın yenidən fəaliyyətə başlamasına vəsilə olması, bu sətrlərin müəllifinin ən böyük səadətidir.

*Çalışmaq bizdən, müvəffəq etmək Rəbbimizdəndir!*

Muhammed Emin Yıldırım

19 Rəbiuləvvəl 1432/22 Fevral 2011



Hz. Xədicə kimdir və İslam tarixində onu bu qədər dəyərli edən ən mühim amillər hansılardır? Onun soyu, ailəsi, Peyğəmbərimizdən əvvəlki həyatı necə idi? Yaşadığı altmış beş illik həyatındakı ən mühim hadisələr hansılar olmuşdur? Xarakteri, şəxsiyyəti, təbiəti və xüsusilə onu digər qadınlardan fərqləndirən xüsusiyyətləri hansılardır? İlk növbədə bu və buna bənzər suallar verilə bilər və bu suallara cavab axtararaq onun həyat dəftərinin səhifələri vərəqlənə bilər. Ancaq bu suallara cavab axtarmadan əvvəl gəlin, Hz. Xədicə anamız haqda bu cür bir dəyərləndirmə apararaq o ümmana dalaq və baxaq görək nə cür cəvhərlər tapacağıq.

O, Hz. Peyğəmbərdən sonra ilk dəfə varlıq aləminin səmasına *Lə iləhə İlləllah, Muhəmmədun Rəsulallah* kəlmeyi-tövhidini söyləyəndir.

O, Hz. Peyğəmbərlə birlikdə ilk dəfə imandan sonra ən böyük həqiqət olan namaz üçün ilahi dərgaha üz tutan insandır.

O, Hz. Peyğəmbərin ilk həyat yoldaşı olma şərəfinə nail olandır.

O, Hz. Peyğəmbərlə peyğəmbərlikdən əvvəl on beş il, peyğəmbərlikdən sonra da on il olmaqla iyirmi beş il eyni yastığa baş qoyandır.

O, Hz. Peyğəmbərin evinə ikisi oğlan, dördü qız olmaqla altı övlad bəxş edəndir.

O, Hz. Peyğəmbərin Əhli-Beyt nəslinin kökü olan Hz. Fatiməni dünyaya gətirən və Hz. Əliyə analıq edəndir.

O, bütün varlığını, malını, mülkünü, sərmayəsini Allah yolunda fəda etməkdən bir an belə geri addım atmayandır.

O, Hz. Peyğəmbərin dilindən cənnətlə müjdələnən ilk bəxtəvər İslam xanımıdır.

O, cahiliyyə dövrünün zülmət qaranlığında kirlənmədən, Məryəm kimi pak və təmiz qalan, bu xüsusiyyəti ilə də *Tahirə* adını qazanan anamızdır.



O, Fironları çox olan bir bölgənin Asiyəsi kimi zülmə üsyan edərək, şirk bataqlığına düşmədən vəhyə yönələrək İslamın *Kübrası* olan insandır.

O, on il nübuvvət və risalət mübarizəsinə bir ana kimi sahib çıxaraq, varlığını əqidəsinə həsr edən anamızdır.

Və o, Xanımlar Aləminin Sultanı olan Hz. Xədicə anamızdır.

Hər səhabənin həyatı bizim üçün əhəmiyyətlidir. Amma bu səhabə yuxarıda saydığımız xüsusiyyətləri şəxsiyyətində cəmləşdirirsə və üstəlik bu səhabə Peyğəmbərimizin mübarək və möhtərəm xanımlarından biri və ən ilki isə, o zaman daha çox əhəmiyyət kəsb edir.

Çünki o xanımlar, Quranın ifadəsi ilə bizim analarımızdır. (Əhzab, 6) Möminlərin anaları olan

Peyğəmbər xanımlarını, ən az analarımız qədər tanımalıyıq. Çünki onları tanıdıqca, onlar haqqında məlumat sahibi olduqca, aşağıdakı mühim nəticələri əldə edərik:

İdeal müsəlman qadın kimliyinin və şəxsiyyətinin nə cür olmalı olduğunu öyrənirik. Xanımların nübuvvət mədrəsəsindəki yerlərini, rollarını, dəyərlərini və yerinə yetirdikləri vəzifələri öyrənmiş oluruq.

Xanımlarının həyatı ilə Hz. Peyğəmbərin şəxsi həyatındakı əxlaqını öyrənirik. Yəni onun bir ata və ər kimi həyat yoldaşları arasında münasibətləri necə qurması kimi çox mühim xüsuslarda məlumat sahibi oluruq. Beləliklə də, ideal ata və ideal həyat yoldaşı olmağın sirlərini öyrənmiş oluruq.

Hz. Peyğəmbərin gecə həyatına, gecəsini necə keçirdiyinə, Rəbbi ilə necə və hansı səviyyədə ünsiyyət qurduğuna şahid oluruq. Çünki bu məlumatları yalnız Onunla eyni yastığı paylaşmaq şərəfinə nail olmuş, o fədakar və çiləkeş analarımızdan öyrənə bilərik.

Bütün bu xüsusiyyətlərinə görə Peyğəmbər evinin xanımlarının həyatları bizim üçün çox əhəmiyyətlidir. Hələ bir də bu xanım, ilk sultan olan Hz. Xədicə olarsa...

Deyə bilərsiniz ki, Hz. Xədicənin digər xanımlardan nə fərqi var? İstəyirsiniz bu fərqi biz deyil, Aləmlərin Sultanı olan Peyğəmbərimizin ﷺ dilindən eşidək.

**"...Allaha and olsun ki, Allah mənə Xədicədən daha xeyirlisini vermədi. Hər kəs məni təkzib edərkən, o məni təsdiqlədi. Hər kəs qapılarını üzümə bağlayarkən, o qapılarını üzümə açdı. Hər kəs məndən qaçarkən, o mənə şəfqətlə qollarını açdı".** (Əhməd b. Hənbəl, *Müsnəd* 6/117)

Hər zaman Hz. Peyğəmbərin ﷺ nəzdində Xədicə anamızın bambaşqa bir yeri var idi. Məhz bu səbəbdən o Xanımlar Aləminin Sultanı idi. O sultanın həyatından alacağımız çox mühim ibrətlər vardır. İnşallah bizlər birlikdə, həmin izləri müəyyən etməyə, anlayaraq həyatımıza tətbiq etməyə çalışacağıq.

Hər səhabənin həyatını yazarkən, həmin səhabənin şəxsiyyətini meydana gətirən, daha doğru bir ifadə ilə desək, şəxsiyyətinin üzərinə inşa edildiyi əsas xüsusiyyətlərini müəyyən etmək məcburiyyətindəyik. Çünki, həyatını öyrənməyə çalışdığımız səhabənin şəxsiyyətinin başlıca xüsusiyyətlərini doğru şəkildə müəyyən edə biləriksə, bunun vasitəsilə çox mühim məlumatlar əldə edərik.

Elə is gəlin, həyat dəftərinin səhifələrini vərəqləməyə çalışdığımız Hz. Xədicə anamızın şəxsiyyətini formalaşdıran əsas xüsusları müəyyən etməyə çalışaq və bunu qavraya bilmək üçün bir az səy göstərək.

Bu barədə çox şey söyləyə bilərik, lakin gəlin xüsusilə Hz. Xədicə anamızın şəxsiyyətinin dörd əsas amilinə diqqət yetirək və bunlardan özümüzə nəticə çıxarmağa çalışaq:

**1. Ədəb:** Şübhəsiz ki, ədəb qadın-kişi hər müsəlman şəxsiyyətin ən əsas xüsusiyyəti olmalıdır. Amma bu, qadında bir az daha çox olmalıdır. Xüsusilə ədəb içərisində incələyəcəyimiz və xanımların ən əsas xüsusiyyəti olan iffət, müsəlman qadının sanki bir bəzəyidir. Hələ iffətsiz bir dünyada və əsrdə yaşamaq məcburiyyətində qaldığımız axırzamanın insanları olaraq ədəb və iffətə hər zamankından daha çox möhtacıq. Məhz bu səbəbdən biz yenidən Xədicə anamızın həyatı ilə ədəbi, iffəti və həyanı öyrənməyə çalışacağıq.

**2. Sədaqət:** Mömin bir insanın imanını qoruya bilməsinin ən başlıca xüsusiyyətidir. Məsələyə yalnız evlilik prizmasından baxsaq, bir evliliyin ömür boyu xoşbəxt şəkildə davam etməsi üçün zəruri olan ən mühim xüsusiyyət yenə sədaqətdir. Hz. Xədicə anamızın həyatında sədaqətin yeri məlumdur. O bizə bir sədaqət timsalı olaraq çox şey öyrədəcəkdir.

**3. Fədakarlıq:** İman bir iddiadır, isbatı ancaq onun yolunda fəda edilənlərin nisbətində dərk ediləcəkdir. Hz. Xədicə anamız istər nübuvvətdən əvvəl çox sevdiyi ərini məmnun etmək baxımından, istərsə də nübuvvət ilə birlikdə Allah-Təalanı və Rəsulunu razı və məmnun etmək baxımından inanılmaz fədakarlıq nümunəsi olmuşdur. O, bizə iman mübarizəsinin ucuz olmadığını, bu mübarizəyə mənsub olduğunu iddia edənlərin fədakarlığı heç bir vaxt gözardı etməmələrinin zəruriliyini sözləri ilə deyil, həyatı ilə öyrədəcəkdir.

**4. Vəfa:** Möminə yaraşan ən mühim vəsflərdən biridir. Vəfa edilən yaxşılığın növünə, dərəcəsinə baxmadan ona misli ilə, ya da daha artığı ilə qarşılıq verməkdir. Vəfa, bəzən edilən pisliyə belə yaxşılıqla qarşılıq verməkdir. Vəfa unutmamaq, unutdurmamaqdır. Vəfa sevmək, sevdiyinin sevdiklərini sevmək, sevmədiklərindən üz çevirməkdir. Vəfa bir ömür sevdiyinin yolu ilə getməkdir. Hz. Xədicə anamız, bizə vəfa adına çox şey söyləyəcək və çox şey öyrədəcəkdir.

Bu vəsflərin Hz. Xədicənin həyatındakı izlərinə keçmədən, həmin izlərdən həyatımıza nələri daşımamız gərəkdiyi məsələsinə toxunmazdan əvvəl, gəlin Ərəbistan yarımadasına gedərək anamız, sultanımız, canımız və cananımız olan Hz. Xədicənin həyat dəftərini vərəqləməyə çalışaq.



Əbrəhənin Kəbəyə hücum etməsindən on beş il əvvəl yəni, miladi təqvimlə 555-ci il idi. Əsədin oğlu Xuveylid ilə Zaidənin qızı Fatimənin evindən bir səs yüksəldi. Səs yeni doğulan bir qız uşağının ağlama səsi idi. Uşaq normal doğuşdan təqribən iki ay əvvəl doğulmuşdu. Buna görə atası "erkən doğulan qız uşağı" mənasına gələn Xədicə adını ona verməyi uyğun görmüşdü. Doğru idi, Xədicə tez dünyaya gəlmişdi. Amma onların zənn etdiyi kimi iki ay deyil, on beş il əvvəl doğulmuşdu. Çünki Aləmlərin Sultanı on beş il sonra dünyaya təşrif edəcəkdi. Kimsənin bilmədiyi bu həqiqəti Allah bilirdi. Xədicə tələsmiş, qış fəslində gəlmişdi, Muhəmməd ﷺ isə on beş il sonra bahar fəslində gələcəkdi. Qədər belə imiş, Xədicə əvvəl gəlməliymiş, gəlib qaranlıq əsri nurlandırmalı, sultanlar sultanına zəmin hazırlama-

lı, arxasından gələcək Muhəmmədə ﷺ yol açmalıymış... İlahi qədərdir bu, arada illər olsa da, biri digərindən on beş il əvvəl dünyaya salam desə də, Allah-Təala bir gün onların yollarını kəsişdirəcək, Xanımlar Aləminin Sultanını, Aləmlərin Sultanı ilə qovuşduracaqdı. Sultana ancaq sultan yaraşar, elə deyilmi? Ata Xuveylid b. Əsədin soyu, beşinci nəsildə Qüreyş tarixinin ən məşhur adlarından biri olan Qusayda Allah Rəsulunun soyu ilə birləşir.

Ana Fatimə binti Zaidənin soyu isə yeddinci nəslin atası sayılan Lüeydə, Hz. Peyğəmbərin soyu ilə birləşir.

Allah Rəsulu, Mariya və Reyhanə analarımızı da sayarıqsa ümumi olaraq on üç xanımla ailə qurmuşdur. Bu on üç xanımından sadəcə Hz. Xədicə anamız, həm ata həm ana tərəfindən Peyğəmbərimizə nəsil şəcərəsi baxımından bu qədər yaxındır. Yəni bu səviyyədə Peyğəmbərimizə yaxın başqa bir xanımı yoxdur.

Burada yeri gəlmişkən, Peyğəmbərimizin ﷺ çox evliliyinə dil uzadan nadanlara cavab olaraq bir neçə cümlə söyləmək istəyirik. Xüsusilə onu qeyd edək ki, Hz. Peyğəmbərin ﷺ həyatı bizim ya da başqa birinin müdafiə etməsinə möhtac olmayacaq qədər pak və təmizdir. Onun həyatı özü-özünü müdafiə etmə qüdrətinə sahibdir. Buna görə kimlərəsə xoş görünmə adına o uca şəxsiyyətin həyatını gizlətməyə heç bir vaxt ehtiyac hiss etməməliyik. Onun evliliklərinə dil uzadanları yalnız insaflı bir araşdırmaya dəvət edirik. Vicdanı olan hər elm sahibi bunu rahatlıqla görəcəkdir ki, Peyğəmbərimizin ﷺ evlilikləri adi bir evlilik

deyil, müəyyən məqsəd və qayələrlə qurulmuş evliliklərdir. Əgər məqsədsiz olsaydı, ya da həmin nadanların iddia etdiyi kimi məhz dünyalıq zövq üçün olsaydı, gəncliyinin zirvəsində hər cür əxlaqsızlığın sərbəst qəbul edildiyi bir dövrdə iyirmi beş il eyni yastığı tək qadınla paylaşmaq qüdrətini və iradəsini göstərə bilərdimi?

Peyğəmbərimizin ﷺ mübarək bərəkətli həyatı ilə maraqlanan hər kəs, bu mövzuyla əlaqədar aşağıdakı xüsusları görəcəkdir:

O, iyirmi beş ilə əlli yaşları arasında, düz iyirmi beş il sadəcə Hz. Xədicə (radiyallahu anhə) ilə evli olmuşdur. Yəni Peyğəmbərimiz peyğəmbərlikdən əvvəl on beş il, peyğəmbərlik verildikdən sonra isə on il bir qadınla yaşamışdır.



Əlli yaşından əlli iki yaşına qədər iki il müddətində Məkkədə dul olaraq yaşamış, Hz. Xədicənin ölümündən sonra ikinci evliliyi yenə dul bir qadın olan Sevda binti Zema ilə olmuşdur.

Əlli iki yaşından vəfat edəcəyi altmış üç yaşına qədər isə on iki dəfə ailə həyatı qurmuşdur. Bu evliliklərin hamısı peyğəmbərlik dövründə Mədinədə olmuşdur. Beləliklə Allah Rəsulunun ﷺ evlilikləri peyğəmbərliklə yaxından əlaqəlidir və hər biri ilahi təlimatla baş vermişdir. İman edən hər kəsə məlumdur ki, peyğəmbərlər əsla ilahi vəhyə müxalif şəkildə, öz nəfslərinə uyğun hərəkət etməzlər. Evlilik kimi mühim bir məsələdə isə əsla...

Burada çox mühim olduğu üçün bir nöqtəyə diqqət çəkmək istəyirəm. Belə ki, Peyğəmbərimizin ﷺ

Hz. Aişədən (radiyallahu anhə) başqa evləndiyi bütün qadınlar dul olmuşdur. Məkkə dövrü bir tərəfə, Mədinə dövründə adlı-sanlı nə qədər qadının: *"Ya Rəsulallah! Sənin evinin xanımı olmaq bizim üçün ən böyük şərəfdir"* deyərək özlərini hədiyyə etməsini belə Allah Rəsulu heç vaxt qəbul etməmiş, bəzi səbəblərlə dul qadınlarla evlənməyi tərcih etmişdir.

Beləliklə Hz. Peyğəmbərin ﷺ üstün şəxsiyyətinə, çox evliliyini bəhanə edərək dil uzadan nadanlara belə deyirik: Boş yerə özünüzü yormayın, bu mövzuda xoşnud olacağınız nəticə ilə qarşılaşmayacaqsınız.

Görəsən Hz. Peyğəmbərin ﷺ evliliklərinə, onun ideal bir örnək olması prizmasından baxdığımız zaman bu evliliklər hansı baxımdan bizə nümunə təşkil edər? Bu çox mühim məsələdir, çünki onun evlilikləri bizə müəyyən mesajlar verir:

**Subay bir gəncə örnək**: Onun Hz. Yusif kimi iffətlə keçən iyirmi beş illik həyatı.

**Bir həyat yoldaşı olan kişiyə örnək**: Hz. Xədicə anamız ilə yaşadığı iyirmi beş illik həyatı.

**Dul bir kişiyə örnək**: Əlli yaşından əlli iki yaşına qədər iki il müddətində Məkkədə dul olaraq yaşadığı həyat.

**İki xanımı olan kişiyə örnək**: Sevda binti Zema və Aişə binti Əbu Bəkr ilə keçirdiyi həyatı.

**Üç xanımı olan kişiyə örnək**: Sevda, Aişə və Hz. Ömərin qızı Hafsa anamızla keçirdiyi həyatı.

**Dörd xanımı olan kişiyə örnək**: Sevda, Aişə, Hafsa və Zeynəb binti Xuzeymə ilə keçirdiyi həyatı. Daha artıq söz deməyə ehtiyac yoxdur. Çünki dörd qadından daha çoxu ilə evlənməyin nümunəvi yönü yoxdur. Bu, yalnız Hz. Peyğəmbərə məxsus bir haldır.

**Xanımı müsəlman olanlara örnək**: Xədicə, Aişə, Ümmü Sələmə və digərləri…

**Xanımı yəhudi olana örnək**: Safiyyə və Reyhanə.



**Xanımı xristian olana örnək**: Mariya.

**Xanımı ərəb olana örnək**: Xədicə, Aişə, Cüveyriyə, Ümmü Həbibə və digərləri…

**Xanımı ərəb olmayana örnək**: Safiyyə, Reyhanə və Mariya.

**Qız uşaqları olan ataya örnək**: Zeynəb, Ruqiyyə, Ümmü Gülsüm və Fatimə.

**Ögey qız uşaqları olan ataya örnək**: Hind binti Atiq, Zeynəb binti Əbu Sələmə, Ümmü Gülsüm binti Əbu Sələmə, Dürrə binti Əbu Sələmə və Həbibə binti Ümmü Həbibə.

**Ögey oğlan uşaqları olan ataya örnək**: Hind və Haris b. Əbu Halə, Ömər və Sələmə b. Əbu Sələmə, Abdullah b. Ümmü Həbibə.

**Kürəkənləri olan ataya örnək**: Əbul-As b. Rəbi, Hz. Osman və Hz. Əli.

**Gəlinləri olan ataya örnək**: Məlikə binti Rifaə (Ömər b. Əbu Sələmə ilə evli), Ümamə binti Həmzə (Sələmə b. Əbu Sələmə ilə evli)

**Nəvələri olan babaya örnək**: Hz. Həsən, Hz. Hüseyn, Hz. Zeynəb…

Hz. Peyğəmbərin mübarək həyatının hər anı, xüsusilə evliliyinin bizim üçün nümunə təşkil etdiyi şübhəsizdir.

Yenidən Hz. Xədicənin həyatına nəzər salsaq, Hz. Xədicənin Avvam, Növfəl, Hizam, Halə və Ruqiyyə adlı qardaş və bacılarının olduğunu görürük. Bu qardaşlarından Avvam, məşhur səhabə Zübeyr b. Avvamın atasıdır. Zübeyrin anası isə Peyğəmbərimizin xalası Safiyyədir. Hz. Xədicə, Zübeyr b. Avvamın bibisidir.



Bacılarından biri olan Halə, Rəbi b. Əbduluzza ilə evlənəcək və ondan Əbul-As adlı bir övladı olacaqdı. Əbul-As isə illər sonra Peyğəmbərimizlə Hz. Xədicənin ən böyük qızları olan Zeynəblə evlənəcəkdi.

Çox zəngin ailəyə mənsub olan Xədicə anamız Məkkənin ən gözəl evində böyümüşdü. Hətta yaşadıqları ev gözəlliyi və Kəbəyə yaxınlığı səbəbi ilə məkkəlilər tərəfindən "*Radiatul-Kəbə*" yəni, "*Kəbənin süd qardaşı*" olaraq adlandırılmışdır. Ata Xuveylid o dövrdə idxal və ixracla məşğul olan tacir idi. Yəmənə və Şama həmişə ticari karvanlar aparar və oradan da müxtəlif mallar gətirərək Məkkənin bazarlarında satardı.

Xuveylid b. Əsəd, qızı Xədicənin doğumundan bir müddət sonra baş verən Ficar müharibələrində iştirak edir və bu müharibələrin birində də vəfat edir. Xədicə anamız da eynilə Peyğəmbərimiz ﷺ kimi əmisi Amr b. Əsədin himayəsində yetim olaraq böyüyür.

Hz. Xədicə gəncliyindən etibarən həmişə əmisi oğlu və o dövrdə Məkkədə fərqli inanca sahib olan Varaqa b. Növfəlin yanına gedər və onunla söhbət edərdi. Varaqa bütlərə ibadət etməyən, onları çirkin görən şəxs idi. O və bəzi yoldaşları (Hz. Ömərin əmisi, Peyğəmbərimizin diliylə cənnətlə müjdələnən Səid b. Zeydin atası Zeyd b. Amr b. Nüfeyl onlardan biri idi) hənif dininə mənsub idi. Məkkənin dini həyatını bəyənməz və gələcək yeni bir peyğəmbərdən bəhs edərdilər. Hz. Xədicə bu söhbətləri dinləyərkən belə dua edərdi: *“Ya Rəbb! Nə olar məni o gələcək peyğəmbərə yaxın et”*.



O həmin an bilmirdi ki, nəinki peyğəmbərə tabe olacaq, hətta onunla eyni yastığı bölüşüb, evinin xanımı və uşaqlarının anası olma şərəfinə nail olacaqdı.

Hz. Xədicə hələ gənc qız ikən bir gün yuxu görür. Yuxuda səmadakı göz qamaşdırıcı bir nurun evinə girdiyini, ordan da sinəsinə daxil olaraq özünü nurlandırdığını görmüşdü. Gördüyü yuxunun təsiri ilə oyanmış və tələsik yuxu yozumunda mahir olan əmisi oğlu Varaqanın yanına getmişdi. Gördüyü yuxudan Varaqaya bəhs etdikdə Varaqa da ən az Xədicə qədər həyəcanlanmış və belə demişdi: *“Müjdələr olsun sənə, ey əmi qızı! Şübhəsiz, gördüyün*

*bu yuxu özlüyündə bir çox işarə daşıyır. İnşallah, Allah sənə və sənin evinə bir nur ehsan edəcəkdir. Doğrusunu Allah bilir! Həmin nur mənim anladığıma görə peyğəmbərlik nurudur.”* (Yəmani, Muhəmməd Abduh; *Ümmül-Müminin Xədicəti Binti Xuveylid Seyyidətun fi Qəlbil-Mustafa*,s.26)

Hz. Xədicə günlərlə bu yuxunun təsirində qalmışdır. Belə ki, hər gün qapısına gələn onlarla elçiləri gözü görməz olmuşdu. Gələn elçilərin ardı-arası kəsilmədiyinə görə əmisi Amr b. Əsəd qardaşı qızına birini seçməsi üçün təzyiq göstərmişdir. Hz. Xədicə artıq bu təzyiqlərə dözə bilmədiyi üçün çox zəngin tacir Əbu Halə künyəsi ilə məşhur olan Malik b. Nəbbaş b. Zürarə ilə evlənmişdir. Bu evlilikdən iki oğlu dünyaya gəlmişdir. Haris və Hind. Hər ikisi də Hz. Peyğəmbərin peyğəmbərliyinə şahid olmaq şərəfinə nail olmaqla yanaşı bu dünyadan şəhid olaraq axirətə köçmüşdür.



Hz. Xədicə anamızın birinci ərindən olan uşaqlarının ən böyüyü Harisdir. O, anasının yanındaykən, Peyğəmbərimizin peyğəmbərliyini eşitmiş və heç tərəddüd etmədən iman etmişdir. Mənbələrdən öyrəndiyimizə görə, peyğəmbərliyin ilk günlərində Peyğəmbərimiz ﷺ aralarında Harisin də olduğu bir qrup səhabə ilə Kəbəyə namaz qılmağa getmişdilər. Namaza durduqları bir vaxtda Məkkə müşrikləri onlara hücum etmiş və Haris b. Əbu Halə şəhid edilmişdir. Beləliklə, peyğəmbərlik mübarizəsinin ilk şəhidi peyğəmbərin evindən biri olmuşdur. Biz hər zaman Sümeyyə və Yasiri İslamın ilk şəhidləri bilirdik. Bəhs etdiyimiz rəvayəti nəzərə alsaq, İslamın ilk şəhidi Haris, ilk şəhid ailəsi isə Yasir ailəsidir. (İbn

Həcər,*əl-İsabə*, c.1, s.333-334; Muhəmməd Hamidullah, *İslam Peyğəmbəri*, c.1, s.96)

Xədicə anamızın digər oğlu Hind də Rəsulallahı ﷺ yaxından tanıma bəxtiyarlığına qovuşmuş və ona ilk iman edənlərdən biri olmuşdur. Daha sonra Mədinəyə hicrət etmiş Peyğəmbərimizlə birgə Bədr və Uhud savaşında iştirak etmişdir. Peyğəmbərimizin vəfatından sonra da Hz. Əlinin yanından bir an belə ayrılmamışdır. Hz. Əliyə bəslədiyi sevginin səbəbi soruşulduqda isə belə deyərdi: *"Siz hiss etmirsinizmi? Əlidən Peyğəmbərimizin qoxusu gəlir"*. O qoxunu qoxlaya-qoxlaya Hz. Əlinin yanından bir ömür ayrılmamışdır. Ammar b. Yasirlə birgə qardaş müharibəsi sayılan Cəməl döyüşündə iştirak etmiş və bu döyüşdə şəhid olmuşdur. (İbn Həcər, *əl-İsabə*, c. 3, s. 2059; İbn Əsir,*Üsdul-Ğabə*, c. 5, s. 391)



Hədis əsərləri içərisində Hind b. Əbu Halənin nəql etdiyi çox mühim bir rəvayət vardır. Dediyimiz rəvayətdə o, Hz. Həsənin: *"Dayıcan! Mənə babam Rəsulallahdan ﷺ bəhs edərsənmi?"* istəyi üzərinə Peyğəmbərimizdən bəhs etmişdir. Həmin rəvayət şəmail[1] bəhsinin ən əhəmiyyətli rəvayətlərindən biri olmuşdur. (Tirmizi, *Şəmail*, 22; *Rüdani*, 8425; Əhməd b.Hənbəl, *Müsnəd*, 1/116)

Hz. Xədicənin Əbu Halə ilə evliliyi çox davam etməmiş və bilinməyən bir səbəblə Əbu Halə vəfat etmişdir. Əbu Halə vəfat etdikdə çox miqdarda mal-mülk və həyatlarından qısaca bəhs etdiyimiz iki

1. Hz. Peyğəmbərin ibadət, əxlaq, davranış, həyat tərzini və şərəfli olan vücudunun gözəlliklərindən bəhs edən bir elmdir. Bu elmə Onun sifətləri, halları, xüsusiyyətləri və sünnəsi də daxildir.

oğlan övladı ilə Hz. Xədicə anamızı dul buraxmışdır.

Hz. Xədicə (radiyallahu anhə) çox qısa müddət dul qalmışdır. Çünki, sanki heç evlənməmiş kimi yenə hər gün evlilik təklifləri ilə qapısı döyülürdü. Beləliklə, ikinci dəfə Məkkənin ən hörmətli ailələrindən olan Məhzunoğullarından Atiq b. Aiz ilə evlənmişdir. Bu evlilikdən də Hind adlı bir qızı dünyaya gəlmişdir. Bu qız böyüyüb Sayfi b. Ümeyyə ilə evlənəcək, bu evlilikdən Mədinədə Muhəmməd adında övladları olacaq və ondan "*Tahirənin Nəsli*" adı ilə soyları davam edəcəkdi. (İbn Həbəb, *əl-Muhabbər*, s.79; İbn Hazm, *Cəmhərətu Ənsabil-Arab*, s.142)

Hz. Xədicənin ikinci evliliyi də uzun çəkmədi. Qədər planındakı təqdir, sanki araya girən bu şəxslərə "çəkilin aradan, sultana ancaq sultan yaraşar" deyərcəsinə onu Hz. Muhəmmədə ﷺ hazırlayırdı. Lakin heç kim bu ilahi təqdirdən xəbərdar deyildi.

Hz. Xədicə ikinci əri Atiqi itirdiyi vaxt 37 yaşında idi. Bu evliliyin sona çatması ilə yenə də Xədicə anamızın qapısı evlənmək üçün gələnlərlə dolurdu. Lakin onlar Xədicənin daxili dünyasında aldığı qərardan xəbərsiz idilər. Hz. Xədicə yeni bir evlilik məsələsini özlüyündə bitirmişdi. Həmin kilidi açacaq ancaq bir insan var idi o günlərdə... Amma o insanın kim olduğunu nə Xədicə, nə də açarı əlində tutan Aləmlərin Sultanı Hz. Muhəmməd ﷺ bilirdi. Təqdir edilən zaman gəlincəyə qədər gözləməli idi... Xədicə gözləyir, Muhəmməd də gözləyirdi. Amma gözləməyənlər də var idi. Xədicə kimi zadəgan, əsl-nəcabətli və zəngin bir qadınla evlənmək üçün

kimlər onun qapısını döyməmişdi ki; Əbu Süfyan, Əbu Cəhil, Vəlid b. Muğirə və başqaları…

Amma cavab hər zaman eyni idi: “Xeyr! Evlənməyi düşünmürəm”. Gün gələcək o könül sandığının açarını əlində tutan Əbdulmuttəlibin yetimi Muhəmməd ﷺ qapalı sandığı açınca bu təkəbbürlü insanlar dəliyə dönərək belə deyəcəkdilər: “Xuveylidin qızı bizi qoyub, Əbu Talibin yetiminə ərə gedəcək?”. Hətta bəzi tarixi mənbələr Məkkənin bu təkəbbürlü insanlarının Hz. Peyğəmbərin peyğəmbərliyinə düşmənçiliklərinin səbəblərindən biri olaraq Hz. Xədicənin Peyğəmbərimizlə evliliyinin ortaya çıxardığı bu həsədi göstərirlər.



Bu həsəd illər sonra bir daha ortaya çıxacaqdı. Adı çəkilən bu daş ürəkli müşriklər: “Allah bizləri yox, Əbu Talibin yetiminimi peyğəmbər seçdi?” - deyəcəkdilər.

Onların nə deməyindən asılı olmayaraq qədərdə təqdir edilənlər bir-bir həyata keçirdi. Xədicə anamız, o gün evlilik düşüncəsini özündən bir kənara qoymuş, Allahın onun üçün təqdir etdiyinə razı olaraq qarşısına çıxacaq bəşəriyyətin sultanı Hz. Muhəmmədi ﷺ gözləyirdi.

Xədicə anamızın dul olaraq yaşadığı o üç il çox əhəmiyyətlidir. Həmin vaxtlar Məkkədə hər cür əxlaqsızlıq normal hal kimi qəbul edilirdi. Belə bir dövrdə gənc sayıla biləcək bir yaşda gözəlliyi, əsl-nəcabəti və zənginliyi dillərə dastan olmuş birinin iffəti ilə yaşaması çox çətindir. Amma o, iffət abidəsi olaraq həyasızlığın qarşısında həyasına bürünərək ba-

taqlıq içərisində bir gül kimi özünü mühafizə etməyə çalışırdı.

Həmin dövrdə Hz. Xədicənin davranışı onun iki ləqəblə çağırılmasına səbəb oldu. Biri iffət və həyasından dolayı *Tahirə*, digəri isə ticarətə davam etməsi səbəbi ilə *Tacirə* ləqəbi idi.

O, *Tahirə* idi, tər-təmizdi; harama, həyasızlığa, çirkinliyə nəinki həyatında, heç yuxularında belə yer verməmişdi. Belə olunca ilahi iradə, əlbəttə *Tahirəni*, *Tahirə* layiq görəcəkdi. İlahi kəlamımız Quran bu həqiqəti belə bəyan etmirmi?

**“Xəbis/pis qadınlar, xəbis/pis kişilərə, pis kişilər isə pis qadınlara, tayyib/təmiz qadınlar təmiz kişilərə, təmiz kişilər də ancaq təmiz qadınlara layiqdirlər/yaraşırlar...”** (Nur, 24/26)



Həyasızlıq və iffətsizlik dənizində üzənlərin təmiz həyat yoldaşı istəmə haqları varmı? Əvvəl onlar təmizlənməli, etdikləri çirkin işlərdən üz çevirməlidir ki, Allah (cəllə cələluhu) onlara təmiz və halal süd əmmiş həyat yoldaşları nəsib etsin.

Xədicə anamız *Tahirə*, tər-təmiz olduğu üçün Allah da ona, təmizliyin zirvəsində olan və bu sahədə həqiqətən rəqibsiz bir həyat yoldaşı nəsib edəcəkdi.

O illərdə Hz. Xədicə özünün ticarət əlaqələrini idarə edə biləcək birini axtarırdı. Əslində Hz. Xədicə bir neçə dəfə Yəmənə yolladığı ticari karvanlarını, gənc və çox qabiliyyətli olan Əbu Talibin yetimi Muhəmməd ilə göndərmiş və ondan çox məmnun qalmışdı. Bəlkə də, Hz. Xədicənin ağlından yenə o keçirdi, amma açıq şəkildə deməmiş, belə birini ax-

tardığını Məkkədə elan etmişdi. O gün bu elan Məkkənin ən mühim xəbəri olmuşdu. Çünki Hz. Xədicə Şama çox böyük bir karvan yola salacaqdı. Həmin karvan o günə kimi yola çıxan ən böyük karvan idi. Hətta İbn Sad *Təbaqatında*, bu karvanın böyüklüyünü bildirmək üçün: "Bütün məkkəlilərin mallarına bərabər bir karvandır." - deyir. (İbn Sad, *Təbaqat*, c.10, s.18/19)

Əbu Talib belə bir karvan üçün adam axtarıldığını eşidib qardaşı oğlu Muhəmmədi çağıraraq belə dedi: "Ey Muhəmməd! Eşitdim ki, Xuveylidin qızı böyük bir karvan yola salır. Bu karvanı sən aparmalısan. Çünki bizim maddi imkanımız yoxdur və oradan əldə ediləcək qazanca ehtiyacımız var. Əgər qəbul edərsənsə, mən gedib Xədicə ilə danışım, kimə nə qədər verəcəksə, sənə onun iki qatını versin, çünki o, sənin dürüstlüyünü çox yaxşı bilir, bu təklifimi qəbul edəcəyini düşünürəm."



Peyğəmbərimiz ﷺ yaşlı əmisini gözəlliklə dinlədikdən sonra belə dedi: **"Əmi! Sən necə istəyirsənsə, elə olsun. Bilirsən ki, mən sənin sözünə qulaq asaram və sözündən əsla çıxmaram."**

Əbu Talib qardaşı oğlunun yanından ayrılan kimi *Tahirə* ləqəbli Xədicənin yanına gəldi. Karvanlarını aparacaq insan olaraq qardaşı oğlu Muhəmmədi ona təklif etdi və iki qat ödəniş etməsini tələb etdi. Xədicə bu təklifə bu cür qarşılıq verdi: *"Ey Əbu Talib! Həqiqətən sən Muhəmmədə layiq bir ödəniş istəmiş oldun. Əgər məndən bundan da artığını istəsəydin, heç etiraz etmədən verərdim."* (İsfəhani, *Dəlailun-Nübuvvə*, 1/178)

Çünki Xədicə anamız daha əvvəlki ticari münasibətlərində Muhəmmədi ﷺ az da olsa tanıma imkanına sahib olmuşdu və o bunu çox yaxşı bilirdi ki, əgər karvan göndəriləcəksə, aparan Muhəmməd kimi *əl-Əmin* olmalıdır. Əgər bir yola çıxılacaqsa, rəhbər Muhəmməd kimi *əl-Əmin* olmalıdır. Əgər çöllərdə səyahət ediləcəksə, öndər Muhəmməd kimi *əl-Əmin* olmalıdır. Əgər dənizlərdə gəmilər üzəcəksə, kapitan Muhəmməd kimi *əl-Əmin* olmalıdır.

Və elə də oldu. Xədicə anamız tələb edilən məbləğ müqabilində karvanları Peyğəmbərimiz ilə göndərməyə razı oldu. Hz. Xədicə bu karvana fərqli bir gözlə baxırdı. Bu karvandan çox gəlir əldə etmək istəyirdi. Amma bu gəlir sadəcə dünyəvi bir qazancdan ibarət deyildi; onun əsl məqsədi və əldə etmək istədiyi qazanc Muhəmmədi ﷺ daha çox tanımaq və onun haqqında daha fərqli məlumatlar əldə etmək idi. Bu məqsədlə çox zəkalı və qabiliyyətli olan Meysərə adlı xidmətçisini karvanla göndərmək qərarına gəldi.



Meysərəyə bir vəzifə verilmişdi. O, Muhəmmədi ﷺ gözəl şəkildə müşahidə etməli, onun hər hərəkətini, ticari münasibətlərini və ümumi əxlaqını addım-addım izləyib Xədicəyə hesabat verməli idi. Peyğəmbərimiz isə, Meysərənin bu vəzifəsindən xəbərsiz idi.

Beləliklə lazımi hazırlıqlar görüldükdən sonra karvan yola düşdü.

Allah Rəsulunun ﷺ həyatında çox önəmli olan bu səfərini və xüsusilə ticari əxlaqının nübuvvətdən

əvvəl belə hansı səviyyədə olduğunu bir sonrakı hissəyə həvalə edirik.

Bu hissəni bitirərkən isə çox vacib olan bir məsələyə diqqəti çəkmək istəyirəm:

Hz. Xədicənin dul olduğu halda Muhəmməd ﷺ kimi bir həyat yoldaşına sahib olması ilahi bir qədər idi. Bu qədərin həyata keçməsi üçün bəşər planında ortaya qoyulan iradə sahibi isə Hz. Xədicə anamızın şəxsiyyəti idi. O, *Tahirə* idi, tər-təmiz və pak idi. Allah da ona *Tahir* olan; təmiz bir ər nəsib etdi. Buna görə də Xədicə kimi xanımlarla evlənmək istəyənlər və ya Muhəmməd kimi onun uca əxlaqından nəsiblənmiş bir oğlanla ailə qurmaq istəyənlər *Tahir* və *Tahirə* olmaq məcburiyyətindədirlər.



*Tahir* olmayanın *Tahirə, Tahirə* olmayanın isə *Tahir* birisini istəməyə haqqı yoxdur. Çünki Allah (cəllə cəlaluhu) hər zaman pisi pisə, təmizi isə təmiz olana layiq görəcəkdir.

Əvvəlki hissədə Xanımlar Aləminin Sultanı olan Hz. Xədicənin (radiyallahu anhə) həyat dəftərini vərəqləməyə cəhd etmiş, xanım olmasına baxmayaraq, qadın-kişi fərq qoymadan bütün müsəlmanlara örnək ola biləcək bir şəxsiyyətin xüsusiyyətlərini anlamağa çalışmışdıq.

İslam tarixində nümunə olan şəxsiyyətlərin qadın və ya kişi olmasının heç bir fərqi yoxdur. Xüsusilə də nübuvvət iqlimində dəyər qazanmış insanlar olan səhabələrin qadın və kişilərdən ibarət olması, qadınlara sadəcə qadınların, kişilərə də sadəcə kişilərin örnək olacağı demək deyil. Hərçənd ki, xanımların xanımlara, kişilərin də kişilərə örnək olması bir baxımdan doğru olan seçimdir. Seçilmiş və ən xeyirli cəmiyyət olan Səhabə nəslinin hər bir fərdi qadın və kişi olmasına baxmayaraq hər yönü ilə bizə örnək, rəhbər və qaranlıqlar içərisində yolumuzu işıqlandıran hidayət çıraqlarıdır.

Beləliklə xanım səhabələrdən alacağımız çox mühim mesajlar vardır. Üstəlik bu xanımlar Peyğəmbər evinin sakinləridirsə, aləmlərə rəhmət olaraq göndərilən Peyğəmbərimiz ﷺ ilə eyni yastığı paylaşma şərəf və bəxtiyarlığına nail olmuşlarsa, daha çox əhəmiyyət kəsb edirlər.

O günün şərtlərində Məkkə kimi heç bir iffət sərhədinin olmadığı qaranlıq bir zaman və məkanda Hz. Xədicə böyük bir sərvət ilə dul olaraq yaşadığı zaman evinə qapanıb, rahat şəkildə yaşamağın əvəzinə, bataqlıqda belə necə batmadan yaşana bilinəcəyini aləmə göstərmə təlaşıyla ticarət həyatına davam etdi. O günlərdə Xədicə anamız otuz yeddi yaşlarında idi və Məkkədə hər kəsi heyran edəcək həyat yolunu mənimsəyərək, "nə edim ətrafım iffətsizdir, əxlaqsızdır, hər cür günahı normal görür, mən də cəmiyyətə uyuram" - demədən, iffətsizliyi iffətə, qaranlığı aydınlığa, ədəbsizliyi ədəbə, hər cür çirkinliyi isə paklığa çevirdi. Artıq o, cahiliyyə dövründə belə *Tahirə, ceyyidə/təmiz, gözəl və tacirə* deyə anılmağa başlamışdı.



Hz. Xədicə anamız üzərindəki iffət libası ilə ticarətinə davam etdi. Bir neçə dəfə Yəmənə tərəf göndərdiyi kiçik ticari karvanlara Muhəmmədi ﷺ rəhbər olaraq seçdi. *Muhəmmədul-Əmin* heç kimsənin o gün vərdiş etmədiyi bir güvən və təhlükəsizlik içərisində karvanları aparıb gətirdi. Xədicə anamız, onda başqalarında olmayan bir hal görmüşdü. O halı daha da yaxından tanımağa çalışır, Muhəmmədin ﷺ gənc yaşına baxmayaraq gözlərindəki o dərin və mənalı baxışların səbəbini öyrənmək istəyirdi.

Bunun üçün ən gözəl fürsət Şama tərəf göndəriləcək olan böyük ticari karvan idi. Əbu Talib karvana nəzarət üçün qardaşı oğlu Muhəmmədi ﷺ təklif etmiş, belə bir fürsəti gözləyən Xədicə anamız da dərhal təklifi qəbul etmişdi. Xüsusilə Peğəmbərimizi müşahidə etsin və səfər əsnasında gördüklərini gəlib

məlumat versin deyə də çox etibar etdiyi xidmətçisi Meysərəni də onunla göndərmişdi.

Hz. Xədicə (radiyallahu anhə) bu planı qurarkən, *Muhəmmədul-Əmin* olan Peyğəmbərimiz bunlardan xəbərsiz idi. Onun bir həyəcanı var idi. O da karvanı sağ-salamat bir şəkildə gedəcəyi yerə çatdırmaq və apardığı kimi geri qaytarmaq idi. O, özünün gələcəkdə kim olacağından xəbərsiz idi, amma Allah (cəllə cələluhu) çox yaxşı bilirdi ki, *rəhbəri Muhəmməd olanın yolçuluğunda fəlakət olmaz.* Çünki Muhəmməd demək etibar deməkdir. Muhəmməd demək təhlükəsizlik deməkdir. Muhəmməd demək salamatçılıq deməkdir. Muhəmməd demək məhəbbət deməkdir. Bu, o gün də belə idi, bu gün üçün də belədir, sabah üçün də belə olacaqdır. Allah üçün bir deyin, kim Muhəmmədin ﷺ rəhbərliyində yola çıxdı, başına bir iş gəldi, fəlakət ilə qarşı-qarşıya qaldı?! Kim Muhəmmədin ﷺ mürşidliyində yola çıxdı, çöllərdə yolunu itirdi?! Kim Muhəmmədin kapitanlığında gəmilərini dənizlərdə üzdürdü, o gəmiləri batırdı, ya da quldurların hücumuna məruz qaldı?! Əlbəttə, heç kim... Əgər rəhbər odursa, çətin yollar güllük-gülüstanlıq olar. Əgər rəhbər odursa, sərt yoxuşlar düz ova olar. Əgər rəhbər odursa, düşmənlər ya məğlub olar, ya da candan bir dost olar. Buna görə bəzən öz-özümüzə sual verməliyik: "Həyat karvanımızın sarvanı kimdir? Karvanın sarvanı odurmu, yoxsa onunla uzaqdan yaxından əlaqəsi olmayan biridirmi?"

Muhəmmədul-Əmin belə böyük bir karvanın başında, yanında Meysərə olduğu halda Şama doğru yola düşdü. O mübarək ayaqlar ikinci dəfə həmin

torpaqlara dəyəcəkdi. Peyğəmbərimiz ﷺ ilk dəfə 12-15 yaşlarındaykən əmisi Əbu Talib ilə oralara doğru yola çıxmış, əmisi Rahib Bahiranın xəbərdarlıqlarını nəzərə alaraq qardaşı oğlunu alıb geri qayıtmışdı. Sanki o torpaqlar on ildir yas tutur, Muhəmmədin ayaq izlərindən məhrum olmanın acısı ilə Rahib Bahiraya sitəm edirdi. O çöllər, o torpaqlar "görəsən bir də Muhəmmədə qovuşarıqmı, o bizim üzərimizdən bir daha keçərmi" - deyə Allaha istəklərini ərz edirdilər. Allah (cəllə cələluhu) Muhəmməd ﷺ ilə qovuşmağı arzulayan hər kəsin duasını qəbul etdiyi kimi onların da duasını qəbul etmişdi. İndi Şam yollarında bir toy-bayram var idi. Əllərdə dəflər, çəkilin yoldan, gələn Muhəmmədul-Əmindir deyirmişcəsinə Mədinədən düz otuz il əvvəl "*talaəl bədru aleyna*" deməyə hazırlanırdı.



Bu səfər bizim üçün çox əhəmiyyətlidir. "Peyğəmbərlikdən əvvəl bir ticarət səfəri nəyə görə bizim üçün bu qədər əhəmiyyətlidir?" - deyə sual edə bilərsiniz. Bunu qeyd edim ki, peyğəmbərlikdən əvvəl baş tutan bu səfər bizə üç önəmli mesaj verir:

1. Allah Rəsulunun ﷺ nübuvvətdən əvvəl əxlaqının hansı səviyyədə olduğunu bizə öyrədir. Peyğəmbərlik quşunun qonacağı yuvanın nə cür bir tərzdə olduğunu göstərir.

2. İşçi və rəhbər əxlaqına dair çox önəmli məlumatlar ehtiva edir. *Muhəmmədul-Əminin* iş əxlaqına dair çox önəmli mesajlar verir.

3. Bölgənin dini baxımdan inanc xəritəsini başa düşməyimizə kömək edir. Xüsusilə həmin günlərdə xristianların sıx olduğu həmin ərazilərdə bu inancın

hansı səviyyədə olduğunu, gözlənən peyğəmbərə qarşı münasibətin necə olacağını bizə öyrədir.

Elə buna görə də siyər tarixi baxımından bu səfər çox önəmlidir. O halda gəlin biz də, bu karvanda iştirak edək və Meysərə kimi Aləmlərin Sultanının səfərini izləyək.

Bu karvanın səfər müddəti düz üç ay oldu. Meysərə Xədicə anamızın tapşırığını yerinə yetirir və addım-addım Peyğəmbərimizi izləyirdi. Bir insanı tanıya bilmənin üç əsas şərti vardır: Birlikdə səfər etmək, eyni məkanı paylaşmaq və ticarət etmək. Meysərə tanımaqla vəzifəli olduğu Muhəmmədul-Əmin ilə çıxdığı səfərdə qeyd edilən bu üç fürsəti də əldə etmişdi. Xüsusilə o dövrün şərtlərində səfərə çıxmaq insanı tanımağın ən asan yolu idi. Çünki səfər insanın həqiqi kimliyinin, şəxsiyyətini formalaşdıran əsas ünsürlərin ortaya çıxma sahəsi idi. Belə ki, Ərəb dilində səfər sözünün kökü "çılpaqlıq" mənasına gəlir. Bununla da, səfərin insanın həqiqi şəxsiyyətini büründüyü hər cür örtüdən sıyrılıb çıxarmasına görə bu adla adlandırıldığı deyilir. Bəlkə bu gün bu səviyyədə məşəqqətli yolçuluqların qalmadığı və qısa zaman ərzində edilən səfərlərin insanı tanımağa kifayət etmədiyi deyilə bilər. Amma bu gün də insanı tanımaq üçün çox önəmli olan bir sahə varlığını davam etdirir. Bu sahə də heç şübhəsiz ki, ticarətdir. Təəssüflər olsun ki, ticarət, xüsusilə bu dövrdə, sinifdə qaldığımız bir sahədir. İllərlə tanıdığınızı iddia etdiyiniz bir insan ilə kiçik bir ticari əlaqəniz olar; ya bir şey alarsınız, ya satarsınız, ya borc verərsiniz, nəticədə onunla bu işi gördüyünüzə min kərə peşman olarsınız. Üç qəpik

üçün illərin dostluğunu bitirmək məcburiyyətində qalar, o işə qol qoyduğunuz üçün özünüzü qınıyarsınız. Tanıdıqca nifrət edər, tanıdıqca ürəyiniz bulanar, peşman olarsınız.

Yaxşı, Aləmlərin Sultanı belə idimi? Əsla! Onu tanıdıqca hər tanıyan kimi, siz də Ona heyran olmursunuzmu? Həyat dəftərini vərəqlədikcə "*həl min məzid*/yenə varmı?" deyib daha çoxuna vaqif olmaq istəyirsiniz. Çünki onu tanıyan ona aşiq olur. Onu tanıyan o təmiz həyatın atmosferi içərisində tam fərqli bir ruh halına qovuşur.



Sözü çox uzatmadan bir çox xatirənin meydana gəlməsinə səbəb olan Peyğəmbərimizin ﷺ üç aylıq bu səfərindən, üç ayrı hadisəni sizinlə bölüşmək istəyirik. Bu rəvayətlər işığında bir çox dərs alacağımız şübhəsizdir.

İlk rəvayəti bizə İbn Sad nəql edir. Bu rəvayətə görə, Şam şəhərinin bir bazarında Peyğəmbərimiz karvana aid bəzi mallarını satır. O anda əslən yəhudi olan bir tacir, Peyğəmbərimizi uzaqdan seyr edir. O, bir az diqqətlə baxdıqda Peyğəmbərimizin ﷺ tam fərqli bir əxlaqda olduğunun fərqinə varır. Çünki o, ticarətdə comərdliyi, yəni asanlaşdırmağı özünə ən əsas qayda olaraq mənimsəmişdi. Nə satarkən, nə də alarkən əsla başqalarını çətinə salmır, and içmir və and içilməsini xoş görmür, qarşısındakıların da and içməsi üçün hər hansı bir zəmin hazırlamırdı. Bu yerdə çox etdiyimiz bir xətaya bu vəsiləylə işıq salmaqda fayda var: Edilən xəta budur ki, sanki Allah Rəsulunun ﷺ bütün sünnələrinə riayət etmişik kimi: "Bazarlıqda qiymətdə razılaşmaq sünnətdir"

deyib, satarkən və alarkən sərhədləri pozuruq. Birincisi, bəli doğrudur, bazarlıqda qiymətdə razılaşmaq sünnətdir. Amma əsas sünnə olan comərdlikdir, yəni asanlaşdırmaqdır, çətinə salmamaqdır, üç qəpik artıq alıb, əskik vermə adına and içib vəziyyəti ağırlaşdırmamaqdır.

Allah Rəsulu ﷺ nübuvvətdən əvvəl belə bir əxlaq ilə Şamın bazarında hər kəsi heyran qoymuşdu. Başqaları bir səbətlik malı saatlarla davam edən danışıqlarla alıb satarkən, Muhəmmədul-Əmin asanlıq göstərərək, çox rahat bir şəkildə alış-verişini edirdi. Uzaqdan bu ticarəti izləyən yəhudi tacir, Peyğəmbərimizi daha yaxından tanımaq üçün onunla alış-veriş etmək qərarına gəlir. Yaxınlaşaraq Peyğəmbərimizin satmaq istədiyi malların qiymətini soruşur və qiymətdə razılaşmağa çalışır. Bazarlığı bir az uzadınca, yəhudi tacir Peyğəmbərimizin məkkəli olduğunu öyrəndiyi üçün, Məkkənin ən məşhur bütləri olan Lat və Uzza adına Peyğəmbərimizdən and içməyi istəyir. Bir anda vəziyyət dəyişir və bir az əvvəl ticarət edərkən hər kəsə təbəssüm edən Muhəmmədin çöhrəsi birdən dəyişir, əqidəsinə, inamına aid bir tələblə qarşılaşdığı üçün qaşları çatılır, səslər yüksəlir və Şamın bazarı gələcəyin Peyğəmbərindən bu sözləri eşidir:

**“İnanmadığım və bu günə qədər dəyər vermədiyim cansız varlıqlar adına məni and içməyə çağırırsan? Mən sevmədiyim o bütlər adına əsla and içməyəcəm.”** (İbn Sad, *Təbaqat*, c.1, s.13)

Bu söz bir anda Şamın bazarının havasını dəyişdirdi. Çünki məkkəliləri ticarət vəsiləsi ilə çox yax-

şı tanıyan şamlılar ilk dəfə belə bir söz eşidirdilər. Yəhudi tacir sözü çox uzatmadan alacağı şeyləri alar-almaz Meysərənin yanına gəldi. Danışılanları diqqətlə izləyən Meysərədən Muhəmmədin ﷺ kim olduğunu soruşdu.

Səfər əsnasındakı ikinci rəvayəti də bizə İbn Sad nəql edir. Meysərə Muhəmmədul-Əmində möhtəşəm bir güvən görmüşdü. Hesablarında elə bir həssasiyyət içərisində idi ki, içdiyi bir stəkan suyun pulunu belə qeyd edirdi. Meysərə bir müddət Peyğəmbərimizin ﷺ hesab işləri ilə məşğul olduğunu görüncə yanına yaxınlaşaraq: *"Ey Muhəmməd! Bir neçə saatdır nə edirsən?"* - dedi. Peyğəmbərimiz dedi: **"Ey Meysərə! Karvanın pulu ilə öz şəxsi pulumu ayırmışdım. Amma necə oldusa, kiçik bir qarışıqlıq oldu. Karvanın pulumu mənim puluma qarışmış, yoxsa mənim pulummu karvanın puluna qarışmış, bilmədim. Bu şübhə içərisində daha çox qalmaqdansa, sən şahid ol ki, bütün pulumu karvanın puluna qatıram. Karvanın bir tək dirhəmi mənim hesabıma keçməkdənsə, mənim onlarla dirhəmim karvanın hesabına keçsin."** (İbn Sad, *Təbaqat*, c.1, s.130)

Meysərənin dili tutulmuşdu. O, illərdir insanlarla səyahət edirdi, amma beləsini heç görməmişdi. Öz-özünə dedi: "Muhəmməd insan, bəşər ola bilməz, bəlkə də bu bir mələkdir." Xeyr, ey Meysərə, o, mələk deyil. Mələkləri belə qısqandırcaq bir bəşərdir. Amma o, adi bir insan da deyildir. Daşlar içərisində yaqut və almazın dəyəri nədirsə, bəşər içərisində Muhəmmədin dəyəri də odur.

Üçüncü rəvayəti başda İbn İshaq və İbn Hişam olmaqla, bir çox siyər və tarix kitabı nəql edirlər. Karvan satacağını satmış, alacağını almış, geri dönmək üçün yola çıxmışdı. Busra deyilən yerə çatdıqda dayanmışdılar. Karvan içərisində olanlar hər biri fərqli bir məkanı seçərək, istirahətə çəkilmişdilər. Peyğəmbərimiz ﷺ də istirahət etmək üçün qoca bir çinar ağacının altını seçmişdi. Çünki bu ağacın onda bir xatirəsi vardı. O, ilk dəfə Şama gedərkən əmisi ilə bu ağacın altında oturmuş və Rahib Bahira ilə bu ağac altında tanış olmuşdu. İndi Rahib Bahira vəfat etmiş, yerinə Rahib Nastura keçmişdi. Rahib Nastura monastırın pəncərəsindən o ağacın altında əyləşən gənci heyranlıqla izləmiş və özünü saxlaya bilməyərək Meysərənin yanına gəlmişdi. Nastura Meysərədən *"Bu gənc kimdir?"* - deyə soruşduqda, Meysərə belə demişdi *"O, Muhəmməd b. Abdullahdır. Harəm əhlindən bir gəncdir."* Rahib Nastura bu cavab qarşısında belə demişdi: *"Vallahi! Bu ağacın altında bu günə qədər Peyğəmbərlərdən başqa oturan olmadı. Mən inanıram ki, bu gənc, ümmətin gözlədiyi son peyğəmbərdir. Nə olar, ona çox yaxşı baxın."* (İbn Hişam, *Sirə*, c.1, s.250; İbn Sad, *Təbaqat,* c.1, s.130)

Daha sonra Rahib Nastura həyəcanla Peyğəmbərimizin ﷺ yanına gələrək oturdu, onunla bir az söhbət etdi və alnından öpərək ona olan məhəbbətini dilə gətirdi.

Meysərə bütün bu gördüklərini zehninə bir-bir həkk edirdi. Beləliklə karvan artıq Məkkəyə çatmışdı. Peyğəmbərimiz karvanın sahibi olan Xədicənin yanına getmiş və böyük bir diqqətlə karvanın

haqq-hesabını ona təslim etmişdi. Xədicə anamız Peyğəmbərimizin həssasiyyətinə və ədalətinə heyran olmuşdu. Karvan böyük bir gəlir əldə etmişdi. Xədicə anamız Peyğəmbərimizin bu dürüstlüyünü təqdir etmiş və ona razılaşdıqları puldan artıq ödəmiş, bundan başqa hədiyyələr verərək razılığını ifadə etmişdi. Peyğəmbərimiz Hz. Xədicənin yanından ayrıldıqdan sonra, Xədicə anamız səbirsizliklə əsas eşitmək istədiyi məlumatları almaq üçün Meysərəni yanına çağırmışdı. Meysərə də böyük bir həyəcan ilə səfər əsnasında gördüyü, şahid olduğu nə varsa, bir-bir danışmağa başlamışdı... O gənc ürəyə Meysərə də aşiq olmuşdu, Xədicə də.



Hz. Xədicə Meysərədən aldığı məlumatları əmisi oğlu Varaqaya danışmaq üçün onun yanına getdi və ona izah etmək üçün sözə başladı. Varaqa danışılanları dinlədikcə dedi: *"Ey əmim qızı! Əgər bu danışdıqların doğrudursa, vallahi o, gözlədiyimiz peyğəmbərdir."* Xədicə bu sözləri eşidib daha da həyəcanlandı və orada belə dua etdi: *"Ya Rəbb! Nə olar məni o son peyğəmbərə yaxın et!"*

Bu dua qəbul olmuşdu, amma Xədicə anamız bundan xəbərsiz bir şəkildə evində düşüncələrə dalmış, Muhəmmədə ﷺ nə cür yaxın ola bilərəm deyə fikirləşirdi. Ona yaxın olmaq o gün çox asan idi və Xədicə də əslində ona iş verən adam idi. Bu səbəblə Muhəmmədə yaxın olmağın bir çox yolu var idi. Amma Xədicə anamız *Tahirə* idi, tər-təmiz idi və o *Tahir* birinə talib olduğunu da çox gözəl bilirdi. Yaxşı, iffət pərdəsini yırtmadan Muhəmmədə ﷺ yaxın olmağın bir yolu var idimi?

Xədicə anamız zehnində bu məsələlərlə məşğul olarkən xidmətçisi olan yəhudi əsilli *Nəfisə binti Münyə* adlı qadın onun bu halını görmüş və yanına gələrək nə üçün fikirli olduğunu sormuşdu. Xədicə çox yaxşı tanıdığı bu xanıma dərdini açmış və demişdi: *“Ey Nəfisə! Mən Əbu Talibin oğlunda başqalarında görmədiyim bəzi xüsusiyyətləri görürəm və ona daha yaxın olmağın yollarını axtarıram. Ona yaxın olmağın necə mümkün olacağını mənə deyə bilərsənmi?”*

Nəfisə Hz. Xədicənin bunda məyus olmağına səbəb olacaq bir şeyin olmadığını söylədi. *“Ey xanımım! Səni kədərləndirən şey budurmu? Ona yaxın olmaq çox asandır. Mənə izn verin, onunla danışım.”*



Xədicə anamız bir anlıq həyəcanlandı. Ona qovuşma ümidi ilə sevindi. Amma bir tərəfdən də narahat olaraq qorxdu. İstənilənlər olmalı idi, amma hər şey iffət pərdəsini zədələmədən olmalı idi. Aradakı pərdələr qalxmamalıydı. Nə Hz. Xədicənin iffət libasına bir ləkə bulaşmalı, nə də Muhəmmədin ﷺ pak həyatı qaralmalı idi.

Nəfisə çox qabiliyyətli bir qadın idi. Nəyi, harada və necə danışacağını çox yaxşı bilirdi. O da illər sonra Xədicə anamızın aşiq olduğu o ürəyə aşiq olacaq və iman edərək səhabə olma şərəfinə nail olacaqdı. Amma vaxta hələ var idi, hər kəs kimi o da gözləməkdə idi. Nəfisə Hz. Xədicədən icazə alaraq Muhəmmədin ﷺ yanına gəldi. Əvvəl salam verdi və daha heç bir şey danışmadan birbaşa mətləbə keçərək dedi: *“Ey Muhəmməd! Nə üçün evlənmirsən?”* Peyğəmbərimiz heç gözləmədiyi bir sual ilə

qarşı-qarşıya qalmışdı. Ani şəkildə soruşulan bir suala bir az düşündükdən sonra belə cavab verdi: ***"Ey Nəfisə! Mənim evlənəcək nəyim var ki? Mən necə evlənə bilərəm ki? Nə malım, nə evim, nə də işim var."*** (İbn Sad, *Təbaqat, c. 1, s. 131/132;* İbn Həcər, *əl-İsabə, c. 4, s. 2480)*

Nəfisə Peyğəmbərimizi diqqətlə dinlədi. Maddi cəhətdən sıxıntısının olduğunu görüncə dedi: "*Yaxşı, maddi sıxıntın həll olunarsa, evlənməyi düşünürsənmi?*" Nəfisənin bu ikinci sualı Peyğəmbərimizi daha da həyəcanlandırmışdı: ***"Bəli!"*** **-** dedi. Peyğəmbərimiz bu dəfə: ***"Amma kiminlə?"*** - deyə soruşdu. Söz tam bu yerdə Nəfisənin eşitmək istədiyi suala gəlmişdi. Birbaşa cavab verdi: "*Xuveylidin qızı Xədicə ilə...*"



Peyğəmbərimiz daha da həyəcanlandı, amma bir tərəfdən də məyus oldu. Xədicə kimi zəngin qadın, əsl-nəcabəti və zənginliyi olduğu üçün hər gün qapısını onlarla adlı-sanlı ailələr kəsdirdiyi halda, mənim kimi bir yetimlə heç evlənərmi? Peyğəmbərimiz bir az ümidsizliklə Nəfisəyə dedi: ***"Xədicə bunu qəbul edərmi? Bu mümkün deyil..."*** Nəfisə eşitmək istədiyi cavabı almışdı. Peyğəmbərimizə dedi: "*Ey Muhəmməd! Sən, ondan narahat olma, mən üsuluna uyğun bir şəkildə Xədicə ilə danışaram. Qəbul edərsə edər, etməzsə etməz.*" Peyğəmbərimiz Nəfisəyə: ***"Yaxşı! Danış görək necə olacaq, amma mən bu işin baş tutacağına çox da ümidvar deyiləm."*** - dedi.

Nəfisə böyük bir sevinc ilə Xədicənin yanına gəldi. Xədicə anamız arzuladığı imkanı tapmağın

həyəcanı ilə sevindi və dərhal Peyğəmbərimizə cavabını göndərdi. Cavab, *"Bəli"* idi. Qəlb sandığının üzərində olan kilidlərin açarlarını əlində tutan şəxsin kimliyi bəlli olmuşdu. Kilidləri açacaq olan Əbu Talibin yetimi Muhəmməd ﷺ idi. Hz. Xədicə, Nəfisə ilə cavabını göndərdi və dedi: *"Ey əmimin oğlu! Şübhəsiz ki, mən, sənin mənə olan qohumluq bağının yaxınlığından və sənin gözəl əxlaqına görə təklifini qəbul edirəm. Artıq əmilərinə söylə, işlərin həll olması üçün hazırlıq görsünlər."* (İbn Sad, *Təbaqat*, c.1, 131/132; İbn Həcər, *əl-İsabə*, c. 4, s. 2480)

Peyğəmbərimiz sevincindən nə edəcəyini bilmirdi. Vaxt itirmədən "anamdan sonra anam" dediyi Hz. Əlinin anası Fatimə binti Əsədin yanına gəldi. Baş verənləri danışdı və Xuveylidin qızını ona alması üçün əmisi Əbu Talibin elçi getməsini istədi. Əmisi bu xəbəri eşidib çox sevindi. Həmzə və Abbasla birlikdə Xuveylidin evinə getdi. Oğlan tərəfdən Əbu Talib, Həmzə və Abbas, qız tərəfdən isə Xədicənin əmisi Amr b. Əsəd, əmisi oğlu Varaqa b. Növfəl var idi.



Danışıqlar aparıldı, elçilik edildi və Xanımlar Aləminin Sultanı, Aləmlərin Sultanı olan Muhəmmədin ﷺ ilk xanımı olmasına görə 400 ya da 500 dirhəmə, yəni bu günkü dəyəri ilə 1600 qr. gümüş mehir qarşılığında evləndi.

Xədicə anamız illərdir axtardığını tapmış, yastığının əsl sahibinə qovuşmuşdu. Muhəmməd ﷺ isə, çətin günlərin sığınağı olacaq Xədicəsinə qovuşmanın sevinci içində idi.

Bu mübarək evliliyi və evlilikdən sonra iyirmi beş il davam edən müqəddəs ailə haqqında məlumatları sonrakı hissələrə saxlayaraq, burada bir neçə mühim xüsusiyyətləri qeyd etmək istəyirəm:

İslam və iman çox gözəl bir libasdır. O libası geyinmək istəyənlər, ya da o libası layiqli şəkildə daşımaq istəyənlər şəxsiyyətlərini onların daşınmasına hazır hala gətirməlidirlər. Qüsurlu bir bədənə sahib olan nə qədər gözəl bir libas geyərsə geysin, o libas üzərində gözəl durmayacaq, hətta bəzən çox pis görünəcək. Bədəni gözəl olanın geydiyi libas da onda gözəl görünəcək, sahibinə yaraşacaqdır. İslam və imanı da belə bir libasa bənzətsək, əxlaqı gözəl olana, o libasın necə yaraşacağı hər kəsə məlumdur. Əxlaqı gözəl olana İslam libası da gözəl yaraşacaq, bunu fərq edənlər də: "Filankəsə iman və İslam nə gözəl yaraşmış" - deyəcəklər. Hz. Xədicənin və Muhəmmədin ﷺ şəxsiyyətləri İslamdan əvvəl də tər-təmiz və qüsursuz idi. Təmiz olduğu üçün də iman və İslam libasları onlara çox gözəl yaraşdı. Bizim üzərimizə düşən vəzifə, həyatımızda var olan mənəvi xəstəlikləri aradan qaldırmaqdır. Əgər biz bu xəstəlikləri aradan qaldırmadan, iman və İslam libasını geyinməyə çalışarıqsa, "Allah qorusun" bundan ən böyük zərəri üzərimizdəki o libaslar görəcəkdir. Bu da böyük bir məsuliyyətdir.

Hər kəs vaxtaşırı aşağıdakı sualı öz-özünə verməlidir:

*"Görəsən mən tanındıqca sevilən bir şəxsəm, yoxsa tanındıqca nifrət edilən biriyəm? Mənimlə insani və ticari münasibət quranlar: "Allah bir də onu*

*mənim qarşıma çıxarmasın" - deyir, yoxsa Xədicə kimi: "Ya Rəbb! Onu mənə daha yaxın et!" - deyə dua edir?"*

Əvvəlki hissədə Peyğəmbərimizin ﷺ Busraya etdiyi səfərin bizə mesaj verməsi baxımından nələr qazandırdığına toxunmuşduq. Bu mesajlardan biri də, həmin ərazinin dini inanc xəritəsini anlamağımıza yardımçı olması idi. O gün Hicaz ərazisində Mədinə, Xeybər və ətrafında sıx olaraq yəhudilər məskunlaşmışdı. Şam torpaqlarında, yəni Suriya, Fələstin, İordaniya və ətraflarında isə xristianlar var idi. Məkkədə isə bütlərə ibadət edən müşriklər daha çox idi. Bununla yanaşı sayları az da olsa, bütlərdən üz çevirib, tək Allaha inanan, yəhudilik və xristianlığı çox yaxşı bilmələrinə baxmayaraq, təhrif olunduğu üçün bu iki dini qəbul etməyən həniflər də vardı. Məsələn, Hz. Xədicənin əmisi oğlu Varaqa b. Növfəl bunlardan biri idi. Hz. Xədicənin də anası və atası kimi bütləri çirkin görərək əmisi oğlu Varaqa ilə eyni düşüncədə olduğu rəvayət edilir. Həmçinin Hz. Ömərin (radiyallahu anh) əmisi, Cənnətlə müjdələnən on nəfərdən biri olan əmisi oğlu Səidin atası; Zeyd b. Amr b. Nüfeyl də həniflərdən idi. Bunlardan başqa, çox olmasa da, bəlkə bir əlin barmaqlarının sayı qədər insan, o gün hənif dinini mənsimsəmişdilər. Həm həniflərin, həm yəhudi və xristianların o gün ortaq bir gündəmləri var idi. Bu üç dinin mənsubları, bir çox məsələdə fərqli düşünsələr və fərqli inanclara sahib olsalar da,

bir məsələdə eyni şeyi danışmaqda, eyni mövzunu sıx-sıx təkrar etməkdə idilər. Onların ortaq gündəmi gələcək olan son nəbi, son elçi, son peyğəmbər idi.

Yəni o dövrün hicazlıları bilərək və ya bilməyərək, adını gur səslə söyləməsələr də, *Muhəmməd, Muhəmməd...* deyə nəfəs alıb verirdilər. Onların alim və abid olanları kitablarında bəhs edilən xüsusiyyətlərin bilgisi ilə şəhərləri dolaşmaqda və kimin bu vəsflərə uyğun olduğunu araşdırmaqda idilər. Onlar araşdırdıqca ünvan bəlli olmaqda, barmaqlar həmişə bir şəxsi işarə etməkdə, baxışlar onun üzərinə çevrilməkdə idi. Rahib Bahira onu müjdələməkdə, Rahib Nastura onu xəbər verməkdə, Şamın bazarındakı yəhudi tacir "Bəli, bu odur!" - deyə səslənməkdə, Varaqa "Artıq gözlənən gəldi" - deyərək sevinməkdə idi. Hər kəsin onun haqqında danışmasına baxmayaraq, o özü, bu işarələrə fikir verməməkdə, biriləri son peyğəmbərliyin özlərinə gələcəyini gözlədiyi halda, o, bənzərsiz bir halıyla mən hara, peyğəmbərlik hara deməkdə idi.



Amma ilahi təqdirdə seçilən seçilmiş, planlar cızılmış, olacaqlar proqramlanmışdı. İndi addım-addım əvvəlcədən cızılmış şeylər yaxınlaşırdı. Məhz həmin planın ən mühim tərkib hissəsi Xədicə anamız ilə Hz. Muhəmmədin ﷺ yastıqlarını birləşdirmələri idi.

Karvan Məkkəyə qayıtdıqda, Xədicə anamız Meysərədən Muhəmməd ﷺ haqqında lazımi məlumatları alaraq, iffət pərdəsini aralamadan onunla evlilik yollarını axtardı. Nəfisə binti Münyənin vasitəçiliyi ilə gözlənilən iş həyata keçdi. Əbu Talib, Həmzə və Abbas

gəlin evinə gələrək, əmisi Amr b. Əsəd və əmisi oğlu olan Varaqa b. Növfəldən Xədicəni istədilər. Elçilik uyğun görüldü, qarşılıqlı razılıq ilə toy günü qərarlaşdırıldı, iki ailə də toy hazırlıqlarına başladı. Hz. Xədicə (radiyallahu anhə) o günlər elə xoşbəxt idi ki, sanki uçur, Rəbbinə şükürlər edir, Muhəmmədin xanımı olma bəxtiyarlığı ilə sevinirdi.

Peyğəmbərimiz ﷺ isə eyni sevinci hiss etməsinə baxmayaraq, bir az narahat idi. Heç kimə yük olmadan, kimsəyə əl açmadan toyunu etmək istəyirdi. Əslində Hz. Xədicə çox zəngin idi və Peyğəmbərimizə heç bir xərc düşməsini istəmirdi. Amma Peyğəmbərimiz çox qürurlu idi. Xanımı olmasına baxmayaraq onun malını öz şəxsi işi üçün istifadə etməyi qüruruna sığışdıra bilmirdi. Belə bir vaxtda köməyə əziz bir dost gəldi. Həmin dost Peyğəmbərimizdən iki yaş kiçik, ticarət ilə məşğul olan Əbu Kühafənin oğlu Əbu Bəkr idi. Peyğəmbərimizin ﷺ yanına gəldi "Ey Muhəmməd!" - dedi. Hələ onda Əbu Bəkr də sadəcə Muhəmməd deyirdi. Amma aradan on beş il vaxt keçəcək, bu gün Muhəmməd dediyi dostu *Muhəmmədur-Rəsulallah* olacaqdı. O gündən sonra isə Əbu Bəkr də dostuna Rəsulallah deyə xitab edib, bir ömür onun arxasında olacaqdı. Əbu Bəkr dedi: *"Ey Muhəmməd! Dost hansı gün üçündür, məndən bu hədiyyəni qəbul et. Bununla toy xərclərini qarşılayarsan."* Peyğəmbərimiz: **"Əsla olmaz!"** - deyərək bu təklifi qəbul etmədi. Əbu Bəkr təkid etdi. Nəhayət Peyğəmbərimiz dostunun bu səmimiyyət dolu xahişini qəbul etdi və verilən pulu hədiyyə olaraq deyil, borc olaraq aldı. O, həmin pul ilə toy üçün hazırlıq gördü.

Peyğəmbərimiz bir tərəfdən bu hazırlıqları edərkən vaxtaşırı Xədicəsinə də baş çəkər, onu gördüyü işlərdən xəbərdar edərdi.

Belə günlərin birində Peyğəmbərimiz ﷺ Xədicə anamızın yanına gəlmişdi. Bir az toy hazırlıqlarından danışdıqdan sonra Xədicə anamız dedi: *"Ey əmimin oğlu! Sən də yetimsən, mən də... Sən də anadan və atadan məhrumsan, mən də. Əgər icazə verərsənsə, toyumuza sənin süd anan Həliməni də çağıraq. Sənin süd anan mənim də anamdır. Heç olmasa, Həlimə anamız bu xoşbəxt günümüzdə bizimlə birlikdə olsun."* Peyğəmbərimiz Xədicə anamızın bu nəcib davranışından elə duyğulanmışdı ki, bir anda göz yaşlarına qərq olmuşdu. O belə bir xanım ilə evlənəcəyinə görə Rəbbinə şükür edirdi.

Xədicə anamız bax belə bir sultan idi. O, Muhəmmədi ﷺ həqiqətən sevirdi. Sevən sevdiyinə aid nə varsa, onları da sevər. Sevən sevdiyinin xatirələrinə, qohumlarına, yaxınlarına da sevgi hiss edər. Unutmayaq ki, Məcnun Leylinin eşqinə səhradakı bütün ceyranlarla dost olmuşdu. "Ceyranların gözləri mənə Leylini xatırladır", deyərək gördüyü hər ceyrana dəyər verirdi.

Bu günkü insanlar qoy ibrət alsın. Təəssüflər olsun ki, bu gün evlənməyə qərar verilən kimi, ilk edilən işlərdən biri, ən yaxınlara arxa çevirməkdir. Qızlarımız ailə quracaqları oğlanlara ilk növbədə "ailənlə bir evdə qala bilmərik, mənə yeni bir ev almalısan", - deyə şərt qoşurlar. Bəy və gəlin yeni evə yerləşir, valideynlər isə ya tək-tənha qalır, ya da qocalar evinə göndərilirlər.. İslamın ailə nizamına

verdiyi əxlaq ölçüləri budurmu? Halbuki bizim mədəniyyətimiz evin böyükləri olan yaşlı insanları evin bir rəhmət səbəbi olaraq görür. Onların xoşbəxtliyini, onların razı qalmalarını ən vacib ünsür olaraq qəbul edir. Məhz bu mədəniyyətin müəllimləri olan Xədicə anamız və Hz. Muhəmməddən ﷺ biz bunları öyrənirik.

Peyğəmbərimiz Xədicə anamızın bu təklifini qəbul edir və dərhal Bəni-Sad yurduna bir elçi göndərərək süd anası olan Həliməni toyuna dəvət edir.

Hazırlıqlar bitmiş, yeməklər hazırlanmış, böyük bir sevinc ilə illərdir gözlənilən an gəlmiş, yer üzünün ən nəcib və xoşbəxt yuvasının bünövrəsi qoyulmağa başlanmışdı. Xədicə anamız toyun mötəbər qonağı olan Həlimə anamıza xidmət edir, yanında qalması üçün təkid edirdi. *Muhəmmədin anası mənim anamdır*, - deyirdi. Həlimə anamız Bəni-Sad yurduna geri dönməsinə qərar verdikdə isə, bu səfər Xədicə anamız toyda iştirak etdiyi üçün ona qırx qoyun və minmək üçün bir dəvə hədiyyə edir. (İbn Sad, *Təbaqat*, c.1, s.113; Bəlazuri, *Ənsabul-Əşraf*, c.1, s.5)



Peyğəmbərimiz ﷺ həmin gün çox sevincli idi. Bu sevincinin bir təzahürü olaraq da, atası Abdullahdan etibarən illərdir evinin xidmətində duran dayəsi Bərəkə anamızı köləlikdən azad edirdi. Bərəkə anamızın kim olduğunu bilirsinizmi? Sonralar Ümmü Eymən deyə məşhur olacaq böyük İslam qadınıdır. Bu xanım illərdir Əbdulmuttəlibin evində xidmət etmiş, sonra Əminə anamızın yanında yaşamışdır. Onunla birlikdə balaca Muhəmməd ilə atasının dayılarını ziyarət etmək üçün Yəsribə/Mədinəyə get-

miş, geri qayıtdıqları vaxt Əbvada Əminə anamız vəfat etmişdi. O, yetim Muhəmmədi bağrına basaraq Məkkədəki babasına gətirmişdi. Həmin gündən etibarən Muhəmmədə baxmış, illər boyu ona analıq etmişdir. Allah Rəsulu ﷺ, Hz. Əlinin anası Fatimə kimi, Ümmü Eymənə də anamdan sonra anam deyərək, onun nə qədər dəyərli və qiymətli olduğunu hər kəsə göstərmişdir. (Əhməd b. Hənbəl, *Müsnəd*, 3/212)

Peyğəmbərimiz məhz bu xanımı sevincli günün bir hədiyyəsi olaraq azad etmişdi. Ümmü Eymən azad edildikdən sonra əslən mədinəli olan Ubeyd b. Amr ilə ailə qurmuş, çox gözəl və səadətli bir həyata sahib olmuşdu. Buna baxmayaraq, Ümmü Eymən bu xoşbəxtliyinə heç cür sevinə bilmirdi. Çünki o Məkkə və xüsusilə də Peyğəmbərimiz ﷺ üçün çox darıxırdı. Bu səbəblə də fürsət düşən kimi Məkkəyə geri qayıtmağın yollarını axtarırdı. Ümmü Eymən yenidən Məkkəyə necə dönəcəyini düşünərkən, həyat yoldaşı xəstələndi və bu xəstəliyi səbəbi ilə çox keçmədi ki, vəfat etdi. Ümmü Eymən vaxt itirmədən Məkkəyə geri qayıtdı və yenidən Peyğəmbərimizin evinə daxil oldu. Ümmü Eymən bundan sonrakı həyatını Peyğəmbərimizin yanında yaşadı və heç bir zaman da ondan ayrılmadı.

Toydan sonra Xədicə anamız və Peyğəmbərimiz bir neçə gün Əbu Talibin evində qaldılar. Bu ev həm adam sayı baxımından sıx, həm də dar olduğu üçün Xədicə anamız bir müddət sonra qardaşı oğlu Hakim b. Hizamdan yeni bir ev aldı. Bu ev düz iyirmi beş il bu müqəddəs ailəyə yuva olmuşdur. Hakim b. Hizam bibisi olan Xədicəyə toy hədiyyəsi

olaraq on-on beş yaşlarında bir gənc hədiyyə edir. Bu gəncin kim olduğunu bilirsinizmi? O gələcəkdə Mutə savaşının qəhrəmanı və şəhidi olacaq Zeyd b. Harisədir.

Zeyd çox adlı-sanlı bir qəbiləyə mənsubdur. Atası bölgənin tanınmış qəbilələrindən olan Kəlb qəbiləsinə, anası isə comərdliyi ilə dillərə dastan olmuş Xatəmin qəbiləsi olan Tayy qəbiləsinə mənsubdur. Zeyd beş-altı yaşlarında anası ilə Tayy qəbiləsinə gedərkən quldurların hücumuna məruz qalır. Bu hücum nəticəsində anası öldürülür, balaca Zeyd də Ukaz bazarında kölə olaraq satılır. Onu Hz. Xədicənin qardaşı oğlu Hakim b. Hizam alır. Zeyd bir müddət Hakimin yanında qalır, bu zaman ərzində gəlib gedənlərlə qəbiləsinə və atasına xəbərlər göndərir. Özünün harada olduğunu onlara bildirmək üçün hər cür vasitədən istifadə edir.



Bax bu Zeydi, Hakim bibisi Xədicə anamıza toy hədiyyəsi olaraq verir. Xədicə anamız da gənc Zeydi, həyat yoldaşı Muhəmmədə hədiyyə edir. Zeyd o gündən sonra Peyğəmbərimizin ﷺ yanında qalmağa başlayır, Peyğəmbərimizi tanıdıqca ona heyran olur. İş o yerə çatır ki, ailəsini belə unudur. Artıq heç kimə xəbər göndərmir, axtardığını tapmanın sevinci ilə Peyğəmbərimizin ətrafından bir dəqiqə belə ayrılmır. Amma bir gün Zeydin atası Haris b. Şurahbil və əmisi Kab b. Şurahbil onu axtararaq tapırlar. Zeydin Peyğəmbərimizin yanında olduğunu xəbər alan kimi evə gəlirlər. Evdə Peyğəmbərimizi görür və vəziyyəti danışırlar, Zeydi aparmağa gəldiklərini və nə qədər fidyə istəyirsə istəsin, verəcəklərini vəd edirlər. Peyğəmbərimiz Zeydi çağırır. Zeyd illərdir

görmədiyi atası və əmisini bir anda qarşısında görüb həyəcanlanır və qaçaraq onlara sarılır. Zeyd ağlayır... Amma bu göz yaşlarının iki səbəbi vardı: Biri, atasına və əmisinə qovuşmanın sevinc göz yaşları; digəri isə Muhəmməddən ayrılma qorxusunun göz yaşlarıydı. Zeyd nə edəcəyini bilmirdi. Zeydin atası Peyğəmbərimizə deyir ki: *"Ey Muhəmməd! Nə qədər istəyirsənsə istə, pulunu ödəyib Zeydi alıb evimizə aparaq."* Bu tələb qarşılığında Peyğəmbərimiz ﷺ deyir ki: **"Xeyr, pul istəmirəm. Sadəcə Zeydə soruşaq, sizinləmi getmək istəyir, yoxsa burada mənimləmi qalmaq istəyir? Əgər sizinlə getmək istəyirsə, bir dirhəm vermədən onu alıb apara bilərsiniz. Yox, əgər mənimlə qalmaq istəyirsə, minlərlə dirhəm versəniz belə, onu əsla sizə verməərəm."**

Bundan sonra Zeyddən onun istəyini soruşurlar. O da heç tərəddüd etmədən Muhəmmədi ﷺ seçir. Çünki o da tanımış, o da onun ləzzətini dadmış, o da aşiq olmuş, o da tam fərqli olan iqlimin içinə girmişdi...Ata ilə əmi bir anda nə olduğuna təəccüb etmiş, bir az da əsəbləşərək Zeydə demişlər ki: *"Ar olsun sənə, ey Zeyd! Sən köləliyi azadlıqdan, başqalarını atandan, yad yerləri vətənindən üstün tutursanmı?"* Bu sözləri eşidən Zeyd onlara: *"Ey atam və əmim! Anamı itirib kölə bazarında satılandan sonra illərlə ağlayıb-sızladım və sizə qovuşacağım günün həsrəti ilə alışıb-yandım. Amma nə zaman ki, Muhəmməd ilə eyni məkanı paylaşmağa başladım, vallahi, gözümün qarşısında qətl edilən anamın acısını və sizin ayrılığınızın ürəyimi yandırıb yaxan acısını unutdum. Muhəmməd bütün dərdlərimə dər-*

*man oldu, Muhəmməd bütün yaralarıma məlhəm oldu, Muhəmməd bütün kədərimə səadət oldu. İndi mən onu necə tərk edib sizinlə gəlim?! Əgər onu tərk etsəm, bu ayrılığa əsla dözə bilmərəm!"*

Zeyd bir tərəfdən bunları deyir, bir tərəfdən də ağlayırdı. O ağlayarkən Peyğəmbərimiz də ağlayır, Zeydin atası və əmisi də ağlayırdı.

Zeydin atası Harisə, oğlunun Muhəmmədə bəslədiyi eşqi görüncə onu məcbur etmək istəmədi və onu Muhəmmədin ﷺ yanında qoyaraq qövmünə geri qayıtdı. Zeydin bu nəcib davranışını görən Peyğəmbərimiz onun əlindən tutaraq Kəbəyə gəldi. İnsanların qarşısında əlini havaya qaldıraraq dedi: **"Ey insanlar! Bundan sonra Zeyd Muhəmmədin oğludur. Zeyd bundan sonra Zeyd b. Harisə deyil, Zeyd b. Muhəmməddir. Zeyd mənim varisim, mən də Zeydin varisiyəm."** (İbn Həcər, *əl-İsabə*, c.1, s.256; İbn Əsir, *Üsdul-Ğabə*, c.1, s.510)

Zeyd b. Harisə Peyğəmbərimizə ﷺ hiss etdiyi eşqin mükafatını belə almışdı. O, illərlə Muhəmmədin oğlu Zeyd deyə anıldı. Aradan 30 il keçdikdən sonra Mədinədə nazil olan Əhzab surəsinin 5-ci ayəsi İslamda övladlığın sərhədlərini təyin edənə qədər bu belə davam etdi.

Zeyd artıq Xədicə anamız ilə Peyğəmbərimizin ﷺ müqəddəs ailəsinin bir üzvü olmuşdu. Ümmü Eymən ərini itirib Məkkəyə qayıtdıqdan sonra Zeyd ilə evlənəcək və bu evlilikdən Peyğəmbərimizin öz nəvələrindən ayırmayıb, övladım deyə bağrına basdığı igid komandir Üsamə dünyaya gələcəkdi.

Xədicə anamız ilə Muhəmmədin ﷺ qurduğu bu yuvada Zeyd və Ümmü Eymən xaricində bir neçə insan da var idi. Xədicə anamızın birinci əri Əbu Halədən olan uşaqları Hind və Haris, yenə ikinci əri Atiqdən olan qızı Hind və Xədicə anamızın qardaşı oğlu Zübeyr b. Avvam və daha sonralar bu evə gələcək olan Əli b. Əbu Talib. ..

Avvam Xədicə anamızın qardaşıdır. Peyğəmbərimizin ﷺ bibisi, Hz. Həmzənin kiçik bacısı olan Safiyyə anamız ilə evlənmiş, bu evlilikdən Zübeyr adında bir uşaqları olmuşdu. Avvam vəfat etdikdən sonra da Zübeyr tez-tez bu müqəddəs ailəyə baş çəkəcək, o da Xədicə anamızın və Peyğəmbərimizin tərbiyəsi ilə böyüyəcəkdi. Və gün gələcək Zübeyr də *"Muhəmmədur-Rəsulallah "* deyəcək və Allah Rəsulunun ﷺ bu sözüylə şərəflənəcəkdi: **"Hər peyğəmbərin bir həvarisi vardır, mənim həvarim də Zübeyrdir."** (Buxari, *Cihad*, 40; Müslim, 1879; Tirmizi, 3745)

Xədicə anamız ilə Peyğəmbərimizin ﷺ qurduqları ailə, eşqin zirvələrdə olduğu örnək alınacaq bir yuvadır. Qiyamətə qədər bütün ailələrə örnək ola biləcək, bir İslam ailəsinin nə cür olacağını göstərən bənzərsiz bir yuvadır.

Bu ailənin əsasını təşkil edən ən mühim xüsuslar bunlardır:

- Eşq, sevgi və bunların hər iki tərəfə də qazandırdığı şəfqət və mərhəmət.

- Paylaşma və səbir.

- Tək bir tərəfin deyil, hər iki tərəfin də göstərəcəyi fədakarlıq.

Xədicə anamız ilə Peyğəmbərimizin ﷺ qurduqları ailə məhz bu əsasların hakim olduğu bir yuva idi. Bu yuvada möhtəşəm bir eşq, bənzərsiz bir sevgi, dərdlərə şərik olma və səbir, tərifi qeyri-mümkün olan bir fədakarlıq var idi.

Xədicə anamız evliliklərinin ilk günlərindən etibarən, ətrafında bir neçə xidmətçi olmasına baxmayaraq, həmişə özü ərinə xidmət edərdi. "Bu qədər xidmətçin var, amma yenə də sən özün Muhəmmədə ﷺ xidmət etmək üçün çırpınırsan?" - deyildiyi zaman, o deyirdi: *"Mən, ona xidmət etməkdən böyük bir zövq alır və sevinc duyuram."*

İyirmi beş il davam edən bir evlilik həyatında bu eşqin, bu sevdanın hər zaman zirvələrdə gəzdiyinə şahid oluruq. Yeri gəlmişkən, bəzən düşünürəm ki, ədiblərimizdən inciməyə kifayət qədər haqqımız var! Əgər eşqi qələmə alacaqdınızsa, Leyli ilə Məcnunu deyil, Kərəm ilə Əslini deyil, Fərhad ilə Şirini deyil, Muhəmməd ilə Xədicəni yazmalı idiniz. Çünki digərlərinin eşqi hər zaman ayrılıqla nəticələnmişdi. Bəlkə bir-birinə qovuşsaydılar, o sevgi bitəcək, o sevgi nəğmələrinin yerini dava və gurultular tutacaqdı. Amma gəlin görün ki, Xədicə anamız ilə Muhəmmədin qurduğu ailə iyirmi beş il davam edəcək və həmişə o ailədə eşq hakim olacaq və hətta biri vəfat edib digəri həyatda qaldıqda evinə bir çox xanım gəlin gəlməsinə baxmayaraq, ondan sonra yaşanacaq on üç illik həyatında, Peyğəmbərimiz ﷺ: **"Xədicəm, ahh Xədicəm!" - deyəcək və "Allah mənə Xədicədən daha xeyirlisini vermədi."** -

deyərək, həmişə onu vəfa və minnət ilə yad edəcəkdir.

Bu eşqin və sevdanın ölçüsünün hansı səviyyədə olduğunu bilmək üçün bir önək vermək istəyirəm: Evliliklərinin üzərindən beş-altı il keçdikdən sonra Xədicə anamız, o gün çox təbii bir hal olan çox evliliyə dair Peyğəmbərimizdə ﷺ hər hansı bir səy görməz. Özü-özünə deyər: *"Görəsən Muhəmməd belə bir evliliyi düşünür, amma məndən çəkinirmi, yoxsa mən üzülməyimmi deyə demir?"* O, bu düşüncələrlə yaşayarkən onun bu halını Nəfisə binti Münyə görür. Çox istədiyi Xədicə anamızın kədərini görüb, bunun səbəbinin nə olduğunu öyrənir. Sonra Nəfisə deyir: *"Ey xanımım, istəyirsənsə, mən onunla danışım."* Xədicə anamız danışması üçün ona icazə verir. Nəfisə Peyğəmbərimizin ﷺ yanına gəlir və yeni bir evlilik haqqında nə düşündüyünü soruşur. Peyğəmbərimizin cavabı: **"Xədicəm olduğu halda? Əsla!"**



Hz. Xədicə müdrik bir xanım olaraq illərlə Peyğəmbərimizə ﷺ qanadlarını açmışdı. Lakin yaşının böyüklüyünü, əlindəki malın və imkanların çoxluğunu heç bir zaman ərinə itaət etmə xüsusunda ona əngəl olaraq istifadə etməmişdi.

Evləndikdən bir neçə gün sonra Xədicə anamız könül sandığının üzərindəki kilidlərin açarlarını əlində saxlayan Hz. Muhəmmədə ﷺ bütün sərvətini təqdim etmişdi. "Artıq bu malın və sərvətin sahibi sənsən!" - demişdi. Amma Peyğəmbərimiz bunu qəbul etməmiş: "Xeyr, ey Xədicəm, bu sərvətin əsl sahibi sənsən. Mən isə sadəcə sənin həyat yoldaşınam." - deyərək, xanımının xüsusi mülkiyyətini

hər zaman onun xeyrinə qorumuşdur. Neçə illər bu sərvət ilə ticarət etmiş amma heç bir zaman xanımının mülkiyyətini öz malı olaraq görməmişdir. Gün gələcək Xədicə anamız, əlindəki sərvətin hamısını Allah yolunda sərf edəcək və bundan zərrə qədər də peşman olmayacaqdır.

Əbu Talib bu müqəddəs evliliyin ilk günlərində çox həyəcanlı idi. Həyəcanının səbəbi isə bu idi: O öz-özünə deyirdi: "Qardaşım oğlu Muhəmməd çox həssas bir insandır. Xədicə isə zəngin, böyük bir sərvətin sahibidir. Birdən Xədicə bu zənginliyin verdiyi üstünlük ilə Muhəmmədimi əzərsə, ona itaət etməyib onu üzərsə, mən nə edərəm?" Bu düşüncələrdən əmin olmaq üçün bir gün xidmətçisi olan Nəba adlı bir xanımı Xədicənin evinə göndərmək istədi. Nəbaya dedi: "Xədicənin evinə get və ər-arvad arasındakı münasibətlərin necə olduğuna yaxşı-yaxşı bax, sonra gəlib mənə xəbər ver." Nəba deyiləni edərək evə getdi və bir az da gizli şəkildə Xədicə ilə Muhəmməd arasındakı münasibətlərin nə cür olduğunu müşahidə etdi. Nəba onları izlədikcə heyran olur, belə bir ər-arvad münasibətinə indiyə qədər şahid olmadığını etiraf edirdi. Belə ki, Xədicə anamız hər dəfə danışmağa başladıqda: "Atam anam sənə fəda olsun!" - deyə başlıyır, Muhəmmədin ﷺ bir dediyini iki etmir, öz əlləri ilə ona xidmət edirdi. Muhəmməd isə əlindən gəldiyi qədər ona ev işlərində yardım edir, böyük bir eşq və məhəbbət ilə xanımıyla danışırdı. Nəba gördüklərini yaşlı Əbu Talibə danışıdıqca, Əbu Talib göz yaşlarına boğulur, bir tərəfdən ağlayarkən, digər tərəfdən də şükürlər edirdi. *(Yəmani,* Muhəmməd Abduh, *Ümmül-Muminin Xadicətu Binti Xuveylid Səyyidətun fi Qəlbil-Mustafa, s.68)*

Bu xoşbəxt ailə aradan iki il keçdikdən sonra meyvələr verməyə başlamışdı. İlk meyvə bir oğlan uşağı idi. Allah Rəsulu ﷺ bu oğluna Qasım adını vermişdi. Özü də *Əbul Qasım/Qasımın atası* deyə ləqəb daşıyacaqdı. Qasım iki yaşına çatmadan xəstələnərək vəfat edir. Ata Muhəmməd ilə ana Xədicə, qədərə təslim olaraq bu çətin imtahandan üzü ağ çıxmışdı.

Peyğəmbərimizin yaşı otuza çatdıqda bir qızı olur. O qıza *Zeynəb* adını verirlər. Zeynəb böyüyüb gənc qız olduğunda, Xədicə anamız bacısı Halənin oğlu Əbul-As ilə onu evləndirir. Zeynəb anamız otuz yaşına kimi yaşayacaq və Mədinədə vəfat edəcəkdi.



Zeynəbin doğumunun üzərindən üç il keçməmişdi ki, bu xoşbəxt ailə daha bir qız uşağına qovuşmuşdu. Bu qızlarına da *Ruqiyyə* adını vermişdilər və bir il sonra bir qızları da olmuş, ona da *Ümmü Gülsüm* adını qoymuşdular. Ruqiyyə və Ümmü Gülsüm analarımız da böyüyüb gənc qızlar olduğunda Hz. Muhəmmədin ﷺ əmisi Əbu Ləhəb bu qızlara talib olmuş və onları Ütbə və Üteybə adındakı iki oğlu ilə nişanlamışdı. İslam dəvəti yayılmağa başladıqda, Əbu Ləhəb uşaqlarını məcbur edərək nişanlarını geri qaytarmışdı. Bir müddət bu iki qız ata evində qalarkən, Hz. Osman peyğəmbər evinə kürəkən olmaq üçün qızlardan birinə talib olduqda, Peyğəmbərimiz ﷺ böyük olan qızını, yəni Ruqiyyə anamızı Hz. Osman ilə evləndirmişdi. Bu evlilik Bədr savaşına qədər davam etmiş və Ruqiyyə anamız iyirmi üç yaşlarında xəstələnərək vəfat etmişdi. Bunun üzərinə, Hz. Osman digər anamız Ümmü Gülsüm ilə evlənmiş, bu evlilik də təqribən yeddi il davam etmiş

və Ümmü Gülsüm anamız da, iyirmi yeddi yaşlarında Mədinədə vəfat etmişdi.

Peyğəmbərlikdən 5 il əvvəl idi. Peyğəmbərimiz ﷺ o vaxtlar otuz beş, Hz. Xədicə anamız isə əlli yaşında idi. Həmin il bu xoşbəxt ailənin bir qızı da dünyaya gəlmişdi. Bu doğulan qızın adını Xədicə anamız anasının adı olan Fatimə qoymaq istəyirdi. Peyğəmbərimiz də illərdir ona analıq edən, əmisi Əbu Talibin həyat yoldaşı və Əlinin də anası olan Fatimənin adını qoymaq istəyirdi.

Peyğəmbərimiz ﷺ qızını qucağına aldı, sevindi və dedi: **"Bu, atasının anasıdır. Ona anamın adını qoyacağam."** Xədicə anamız, bu sözləri eşidincə bir az üzülmüş kimi olsa da, bəlli etməməyə çalışdı. Çünki Xədicə anamız Peyğəmbərimizin ﷺ öz anası olan Əminənin adını qoyulacağını zənn etmişdi. Peyğəmbərimiz ﷺ bir az daha açıq danışdı və dedi: **"Ey Xədicəm! Bu qızımıza anamdan sonra anam olan Əlinin anası Fatimənin adını qoyacağam."** Xədicə anamız çox sevinərək dedi: *"Bəli, bu qızımızın adı həm sənin anandan sonra anam dediyin anamızın, həm də mənim öz anamın adı olan Fatimə olsun."*

Həmin il bu xoşbəxt ailə Fatiməni qazandığı kimi gələcəkdə də Fatimənin əri olacaq, o vaxt hələ beş yaşında bir uşaq olan Əlini də qazanacaqdı.

Necəmi? Cavabını sonrakı hissədə birlikdə oxuyaq…

Təqvimlər peyğəmbərlikdən əvvəl 5-ci ili göstərirdi. Bu il yer üzünün ən müqəddəs ailəsi üç əsas hadisəyə şahid olurdu. Bu hadisələrdən birincisi: Fatimə anamızın dünyaya təşrifi idi. Bu kiçik körpə digər bacılarından fərqli idi. Doğumu fərqli, ata və anasının ona hiss etdikləri məhəbbət fərqli idi. Bu fərqi o gün heç kim bilmirdi. Gün gələcək Allah Rəsulu ﷺ digər bütün övladlarını bir-bir itirəcək, təkcə Fatimə qalacaq və Fatiməsini Əliyə verəcəkdi. Muhəmmədin nəsli bu ülvi ailədən davam edəcəkdi. Fatimə Əhli-Beyt olma şərəfinə qovuşacaq və **"Hər Peyğəmbərin nəsli özündəndir, mənim nəslim isə Fatimədəndir."** (Təbərani, *əl-Mücəmul-Kəbir*, 2630) müjdəsinə nail olacaqdı.

Bu ilin ikinci böyük hadisəsi isə, Peyğəmbərimizin ﷺ Kəbənin yenidən inşası hadisəsində *Həcəri-Əsvədin* yerinə qoyulması məsələsində hakimlik etməsidir. Peyğəmbərimiz ﷺ otuz beş yaşlarında müdrikliyin zirvələrini fəth edərkən, bir tərəfdən də etibar və etimadda ən üstün səviyyələrə doğru çıxırdı.

O dövrdə zaman-zaman gələn müxtəlif səbəblərlə Kəbənin divarlarında aşınmalar olmuş, şiddətli sel suları nəticəsində bir çox yeri zədələnmişdi. Kəbənin xidmətində duran Qüreyşin böyükləri toplanaraq onu söküb yenidən inşa etmə qərarına gəlirlər. Hər qövm

öz üzərinə düşən məsuliyyəti böyük bir ibadət coşqusu ilə yerinə yetirir və bu inşaat işində həvəslə iştirak edirdi. Kəbənin divarlarının yenidən inşası bitdikdən sonra ortaya ciddi bir mübahisə çıxdı. Bu mübahisə hər kəs tərəfindən müqəddəs olaraq qəbul edilən *Həcəri-Əsvədin* kim tərəfindən yerinə qoyulacağı ətrafında idi. Bu iş olduqca şərəfli bir vəzifə idi və heç bir qəbilə belə bir şərəfdən məhrum qalmaq istəmirdi. Hər qəbilə bu işin onlara aid olduğunu iddia edir, vəziyyəti daha da gərginləşdirirdi. Hətta qılınclar qınından çıxmış və ciddi bir qarışıqlıq yaşanmışdı. Tərəflər biri-birləri ilə vuruşmağa hazırlanarkən Məkkənin ağsaqqallarından Vəlid b. Muğirə belə bir təklif etdi: *"Ey məkkəlilər! Xeyir üçün başlatdığınız bu işi, şərlə, qan ilə bitirməyin. Gəlin bu işi razılaşma yoluyla həll edək. İndi Kəbənin həyətinə ilk girəcək şəxsi hakim olaraq təyin edək və o şəxsin verəcəyi hökmə hamımız razı olaq."* Bu təklif digər insanlar tərəfindən də qəbul edildi və qılıncları yenidən qınına qoyaraq ilk gələn şəxsi gözləməyə başladılar.

Bir az sonra uzaqdan bir nəfər göründü. Gələn şəxs Əbu Talibin yetimi, Xədicənin əri olan Muhəmməd ﷺ idi. Peyğəmbərimiz o günlərdə ticari bir məqsədlə Məkkədən getmiş və hadisələrdən xəbərsiz bir şəkildə geri qayıtdıqda Kəbəni təvaf etmək üçün, oraya gəlmişdi. Allah Rəsulu Kəbənin həyətinə girdikdə bütün qəbilələr sevinmiş və bu cür qışqırmağa başlamışdılar: *"əl-Əminu irtədəynahu / O, Əmindir (etibar edilən şəxsdir) və biz də onun hər hökmünə razı olarıq."*

Aralarında yaranan mübahisəni Allah Rəsuluna ﷺ bildirdilər. Peyğəmbərimiz dərin zəkası sayəsin-

də heç düşünmədən çıxış yolunu tapdı və: **“Mənə böyük bir bez parçası gətirin.”** - dedi. Parçanı gətirdilər. Onu Kəbədən bir qədər kənarda yerə sərdi. Sonra mübarək əlləri ilə *Həcəri-Əsvədi* götürdü və onu parçanın ortasına qoydu. Daha sonra Məkkədə nə qədər qəbilə varsa, hamısından bir təmsilçi çağırdı və hər birinə həmin parçanın bir küncündən tutmağı tapşırdı. Beləliklə parçanı yavaş-yavaş apararaq daşı qoyulacaq yerə gətirdilər. Sonra Peyğəmbərimiz daşı götürərək öpdü və onu Kəbənin divarındakı yerinə qoydu. Bütün qəbilələr verilən hökmdən və görülən işdən razı qaldılar. Bu hadisə günlərlə Məkkədə danışıldı. Hər kəs Peyğəmbərimizin ﷺ bu zəkasından danışır, ona olan heyranlıq isə gündən-günə daha da artırdı. (İbn Hişam, *Sirə,* c.1, s.209; İbn Sad, *Təbaqat,* c.1, s.146)



Xədicə anamız Peyğəmbərimizin bu məsələnin həllindəki hökmünü eşitdikdə: *“Bax, mənim ərim belə insandır!”* - demiş və o günə qədər onu Muhəmməd ﷺ ilə evlənməsinə görə qınayanlara: *“Məni ona heyran edən şeyin səbəbini indi bildinizmi?”* - demişdi.

Peyğəmbərlikdən 5 il əvvəlki ilin əsas üçüncü hadisəsi isə, bu xoşbəxt ailəyə qazandırılan yeni bir uşaq idi. Bu uşaq o gün beş yaşında olan Əli idi.

O günlər Əbu Talib olduqca yaşlanmış, uşaqları isə çoxalmışdı. Talib, Aqil, Cəfər, Əli və Ümmü Hani bu evin uşaqları idi. Qocalan Əbu Talib, uşaqlarına baxmaqda çətinlik çəkirdi. Vəfalı qardaş oğlu Muhəmməd ﷺ əmisinin bu halına üzülür, əmisinə necə yardım edə biləcəyinin yollarını axtarırdı. Günlərin bir günü digər əmisi Abbasın yanına gedərək

bu problemin həlli üçün nələr edə biləcəklərini danışmağa başladılar. Nəhayət belə bir qərar verdilər ki, hər biri Əbu Talibin bir uşağını himayələrinə götürəcəkdilər. Peyğəmbərimiz ilə əmisi Abbas, Əbu Talibin evinə getdilər və bu düşüncələrini yaşlı olan Əbu Talibə dedilər. Əbu Talib əvvəlcə etiraz etdi. Sonradan bu təklifin doğru olduğuna inanaraq razılaşdı. Böyük oğlu Talib ilə kor olan Aqili yanında saxlayaraq, Cəfər ilə Əlini onlara verdi. Hz. Abbas on beş yaşındakı Cəfəri, Peyğəmbərimiz isə beş yaşındakı Əlini götürdü. Peyğəmbərimiz balaca Əlinin əlindən tutaraq evinə gətirdi və onu Xədicənin şəfqətli qollarına qoyaraq belə dedi:



**"Ey Xədicəm! Mən elə birini seçdim ki, Allah da onu mənim üçün seçmişdir."**

Və həmin gündən etibarən Əli də Xədicə anamızın tərbiyəsində böyüyəcək, Xanımlar Aləminin Sultanı daha bir sultana analıq edəcək və gələcəkdə vəlayət taxtının sultanı olacaq İmam Əlinin mislsiz bir qəhrəman olması üçün əlindən gələni edəcəkdi.

Xədicə anamız bütün uşaqlarının təlim-tərbiyəsi ilə məşğul olurdu. Lakin Əliyə daha çox qayğı göstərir və ona fərqli gözlə baxırdı. Çünki ilahi iradə bunun belə olmasını istəyirdi.

Gün gələcək, Peyğəmbərimiz ﷺ Əliyə ölüm təhlükəsi olduğu halda öz yatağında yatmasını tapşıracaq, o isə "baş üstə" deyib, heç bir tərəddüd etmədən bu əmrə boyun əyəcəkdi.

Gün gələcək Əlidən, Bədrdə aslan, Uhudda igid, Xəndəkdə heydər olması istəniləcək, o da hər

zaman özünə yaraşan şəkildə bir qamət/duruş ortaya qoyacaqdı.

Gün gələcək, Xeybərin fəthi üçün bayraq onun əlinə veriləcək, o, arxasına baxmadan əlindəki zülfiqar qılıncı ilə bütün qalaların qapılarını qıracaqdı.

Gün gələcək, cəmiyyətin rifahı üçün fərdin hüququnu nəzərə almamasını istəyən qardaşlarının qarşısında, heç bir kəsin ən kiçik haqqının belə tapdanmamasını əmr edən ədaləti təsis etmək üçün çalışacaq, haqlı olduğu bir davada haqlı qalmağın mücadiləsini aparacaqdı.

Gün gələcək səltənətin qarşısında imamət deyib hayqıracaq, nəbəvi siyasətin nizamını pozmaq istəyənlərə qarşı əlindən gələni edəcəkdir.



Bu cür çətin imtahanlara hazır ola bilməsi üçün Hz. Əlinin çox sağlam bir müəllimə və çox yaxşı bir təhsilə ehtiyacı var idi. Bu səbəbdən Xədicə anamız onun müəlliməsi olmuş, onu çətin günlərə hazırlamağa hələ o vaxtdan başlamışdı.

Yer üzünün ən nəcib və soylu ailəsi bu fərdlərdən ibarət idi. Xoşbəxt bir yuva idi, səadəti paylaşan xoşbəxt bir evdi, amma yenə də yastığa baş qoyduqda yuxular ərşə çəkilir, yenə də rahat şəkildə sabah açılmırdı. Yaxşı, bəs görəsən səbəb nə idi? Xədicə anamızla Peyğəmbərimizi ﷺ kədərləndirən, yuxusuz qoyan səbəb nə idi?

Görəsən onlar vəfat edən Qasımları üçünmü kədərlənirdilər? Doğulan birinci oğlan uşaqlarının onları tərk etməsinimi özlərinə dərd edirdilər?

Yoxsa Qasımdan sonra ancaq qız uşaqlarının olmasına kədərlənir, bir oğlan övlada sahib ola bilməməyin sıxıntısını yaşıyırdılar?

Yoxsa uşaqlarının dünyəvi gələcəkləri üçün yuxuları ərşə çəkilirdi?

Yoxsa işləri, dolanışıqları, ya da başqa bir dünyəvi dərdləri onların yuxularını qaçırırdı?

Əsla! Bunların heç biri deyildi!

Xədicə anamız və Peyğəmbərimiz ﷺ gecələri yastığa baş qoyduqları zaman insanlıq sancısı çəkirdilər. Bəşəriyyətin o günkü halına baxıb kədərlənir, Allahdan uzaqlaşaraq ibadət edilən cansız varlıqlara verilən müqəddəsliyi gördükcə, sanki ürəkləri parçalanırdı. Diri-diri torpağa basdırılan qız uşaqlarına, cahiliyyətin zülmət qaranlığına məhkum edilən məzlum insanlara baxıb kədərlənirdilər. Yəni onları narahat edən insanların vəziyyəti idi. Onlar bəşəriyyəti bu vəziyyətdən çıxarmağın yollarını axtarırdılar. Onlar bəşəriyyəti nicata çatdıracaq olan mesajları insanlara təbliğ edən rəhbərin yoxluğunu özlərinə dərd edirdilər.

O yastığa baş qoyub bu sancını çəkənlər, bu iş üçün özlərinin seçildiyindən xəbərsiz idilər. Amma ilahi güc peyğəmbərlik quşunun qonacağı yuvanı çoxdan seçmişdi. O gündən sonra Peyğəmbərimizdə ﷺ fərqli bir ruh halı meydana gəlmişdi. Artıq o tənhalığı sevən, yuxular görən, o yuxularda da fərqli mesajların muxatabı olan bir ünvana dönmüşdü.

Peyğəmbərimiz otuz beş yaşına gəldikdə tənhalığı sevməyə başlamışdı. Həmin ilin o vaxtkı adı ilə

Ramad olan Ramazan ayında Nur dağındakı Hira mağarasına getməyə başlamışdı. Peyğəmbərimizin ﷺ Nur dağındakı bu mağaranı necə tapdığına dair fərqli rəvayətlər vardır. Ya çobanlıq etdiyi illərdə bu mağaranı görmüşdür, ya da içlərində babası Əbdulmuttəlib və Hz. Ömərin əmisi Zeyd b. Amr b. Nüfeylin də olduğu Məkkədəki həniflərin bəzilərinin gedib-gəldiyi bu mağaranı onlardan öyrənmişdir. Kimdən öyrəndiyini Allah bilir ancaq, Peyğəmbərimiz bu mağaraya düz üç il boyunca, hər ilin Ramazan ayında gedib-gəlirdi. Oraya gedərək insanlardan uzaq, Rəbbinə isə yaxın olmağa çalışırdı. Otuz səkkiz yaşlarına gəldikdə bu hal onda daha çox müşahidə olunmağa başladı. O günlərdə, Peyğəmbərimiz ﷺ daha çox insanlardan uzaq qalmaq istəyir, zehnində çaxan şimşəklərə, ürəyindən coşub gələn fəryadlara bir çarə axtarırdı. Peyğəmbərimiz bu çarəni harada və necə tapacağını bilmirdi. Amma sanki gedib gəldiyi Nur dağında nə isə baş verəcəyini hiss edirdi. Bu dağ Məkkənin şimal-şərqində, Kəbəyə 6-7 km uzaqlıqda, təqribən 621 metr yüksəklikdə, çıxışı olduqca çətin, qayalarla əhatəli bir dağ idi. Peyğəmbərimiz ﷺ bu dağın zirvəsinə iyirmi metr qalmış ancaq bir insan yerləşəcək qədər olan mağarada o təlatümlü günlərini yaşayırdı.

Müsəlmanlar illər sonra Aişə anamızdan Peyğəmbərimizin Hira mağarasında qalarkən nə etdiyini soruşacaqdılar. Maraqlanmalarının haqlı olan yönləri vardı. Çünki həmin gün üçün hələ vəhy gəlməmiş, ibadət və dualara aid göy süfrəsindən heç bir şey nazil olmamışdı. Yaxşı, bəs Peyğəmbərimiz ﷺ o günlərdə mağarada nə edirdi? Bunu Aişə anamız da

fikirləşmiş, Peyğəmbərimizdən soruşaraq bəzi məlumatlar əldə etmişdi. Bu barədə Aişə anamıza sual verənlərə bu cür cavab vermişdir: *"Peyğəmbərimiz Hirada təhənnüs ilə məşğul idi."* (Əhməd b. Hənbəl, Müslim, 6/233; İbn Sad, *Təbaqat*, c.1, s.194) Təhənnüs: *"Hər hansı bir əmrə əsaslanmadan, şəxsin öz istədiyi və təyin etdiyi ölçülər içərisində ibadət və təfəkkür etməsi"* deməkdir.

Daha qısa və aydın ifadə ilə Peyğəmbərimizin ﷺ Hirada etdiyi işin adı təfəkkür idi. Təfəkkür hər bir möminin vaz keçilməz davranışı olmalıdır. Həmçinin təfəkkür iman nemətinin nuru, ilahi kəlamın təqdir etdiyi bir əməldir.



Peyğəmbərimiz ﷺ də orada saatlar və günlərlə təfəkkür edir, varlıq aləmini və yaradılışı düşünür, nə üçün var edildiyi haqda fikirləşirdi. Həmçinin şirkə bulaşmış bəşəriyyətin yenidən nə cür tövhid inancına qovuşdurula biləcəyinin yollarını axtarırdı. Kədərli və məyus halda Kəbəyə baxır, ürəkdən ah çəkir, atası İbrahimin tövhid ilə yoğurub düzəltdiyi Kəbənin, içindəki üç yüz altmış cansız bütə təhvil verilməsini qəbul edə bilmirdi. Yəni Peyğəmbərimiz mənası "axtarış" demək olan Hirada haqqı və həqiqəti axtarırdı.

Peyğəmbərimiz risalət vəzifəsinə hazırlandığı bu dövrdə ciddi sıxıntılarla qarşılaşır, çətinlik çəkir və bəzən başına gələnlərin ağırlığına görə çox fərqli hallar yaşayırdı. Bu müddət ərzində ona bir ana şəfqəti ilə mərhəmət edib, rəhmət qanadlarının altına alacaq biri lazım idi. Amma o elə biri olmalı idi ki, həm şəfqət və mərhəmətdə zirvədə olsun, həm

də Peyğəmbərimizin ﷺ əsl vəzifəsinə hazırlandığı bir vaxtda mərhəməti ilə ona dəstək olsun. Məhz Xədicə anamız hər iki xüsusiyyəti də özündə cəm edirdi. Onun bu çətin günlərdəki missiyası "Nə üçün Peyğəmbərimiz özündən on beş yaş böyük bir xanımla evləndi?" sualının cavabı mahiyyətindədir.

Xədicə anamız bənzərsiz bir şəfqət və mərhəmət ilə Peyğəmbərimizə yardım etməyə çalışır, amma əsla mərhəmət duyğularının düşüncəsinə, yəni ağlına qələbə çalmasına izn vermirdi. O, tənhalığı sevməyə başlayan ərini heç bir şəkildə qınamır, öz əlləri ilə ona yemək bişirir, onu yola salır, arxasından da Meysərəni göndərirdi. Beləliklə də ərinin başına bir iş gəlməməsi üçün tədbir alırdı.



Xədicə anamız Peyğəmbərimizin əxlaqına olan heyranlığı ilə onun səhv bir iş görməyəcəyini bilir, bu məsələdə ona çox güvənirdi. Bunun üçün həmişə özü-özünə *"Mən həyat yoldaşıma yardım etməliyəm." deyirdi*

Bəli, o yar və yardımçı idi. Bəzən Peyğəmbərimiz ﷺ Hirada çox qalırdı. Belə bir vaxtda Xədicə anamız öz əlləri ilə hazırladığı yeməkləri Peyğəmbərimizə aparmaq üçün dağa tərəf gedir və bu gün insanların çıxmaqda çətinlik çəkdiyi Nur dağına, əlli beş yaşında və səkkiz uşaq anası olmasına baxmayaraq çıxır, onun yanında əyləşir, sözləri ilə onu təsəlli edir, ürəyindəki fırtınaları sakitləşdirməyə çalışırdı. Hava qaralanda Peyğəmbərimiz ﷺ bəzən onunla birlikdə evinə qayıdar, bəzən də onu evə yola saldıqdan sonra yenə həmin mağarada gecələyərdi. Bəzən də Peyğəmbərimiz dağın zirvəsində Xədicəsi-

nin özünə tərəf gəldiyini görüb onu yormamaq üçün özü dağın ətəyinə tərəf enər, onu orada qarşılayar, orada onunla saatlarla söhbət edər və bəzən də orada onunla birlikdə gecələyərdi. Bu gün *İcabə Məscidi* olaraq adlandırılan məscidin yeri Peyğəmbərimiz ilə Xədicə anamızın görüşdükləri yerdir.

Günlər bu minvalla ötüb gedirdi. Artıq Peyğəmbərimiz qırx yaşına qədəm qoymuş, evinin sultanı olan Xədicə isə əlli beş yaşına çatmışdı. Vəhyin nazil olmasından altı ay əvvəl Peyğəmbərimizin ﷺ halı daha da ağırlaşmış, qəribə yuxular görməyə və bəzi fövqaladə hadisələrə şahid olmağa başlamışdı. Belə çətin günlərdə ona yenə də Xədicəsi yardım edir, əlindən gəldiyi qədər ürəyindəki narahatlığa ortaq olmağa çalışırdı. Peyğəmbərimiz də başına gələn hər hadisəni Xədicəsi ilə bölüşürdü. Çünki Xədicə anamız, onu böyük bir diqqət ilə dinləyir və dərdinə dərman ola biləcək sözlər deyərək ona səbri tövsiyə edirdi.

Belə çətin günlərin birində Peyğəmbərimiz ﷺ bir yuxu görmüşdü. Buxarinin bizə nəql etdiyinə görə Peyğəmbərimiz gördüyü yuxunu belə danışırdı: “Evinin üstünə bir taxta çəkilmiş, bu taxtanın düz ortasından dəlik açılmış, bu dəlikdən aşağıya göz qamaşdırıcı bir nərdivan sallanmışdı. Bu nərdivandan heç tanımadığı iki nəfər enmiş, yanına gəlmiş, biri sağ, digəri sol tərəfində oturmuşdu. Beləliklə, gələnlər əməliyyata bənzər nə isə edərək qabırğa sümüklərini açmış, döş qəfəsindəki qəlbinə yönələrək ürəyini çıxarmışdılar. Ürəyini əlinə alan biri digərinə demişdi ki: “Bu saleh şəxsin ürəyi necə də gözəl və təmizmiş.” Sonra o ürəyi yuyub və nəhayət təkrar

yerinə qoyaraq bədənini bağlamış və yoxa çıxmışdılar." (Buxari, Kitabus-Salət, 1)

Peyğəmbərimiz ﷺ bu yuxunun təsiri ilə oyanmış və dərhal Xədicənin yanına getmişdi. Gördüyü yuxunu danışmış və **"Qorxuram, ey Xədicəm!"** - demişdi. Peyğəmbərimiz qorxurdu, bu cür ruh halına tab gətirmək mümkün deyildi və o da bir insan olaraq bu hallardan həyəcanlanırdı.

Bu deyilənlər qarşısında Xədicə anamız təbəssüm edir: *"Xeyr, ey Muhəmməd! Qorxma, Allah sənin üçün əsla şər deyil, xeyir murad edir!"* - deyirdi.

Bu hallar davam edərkən, Peyğəmbərimiz ﷺ daha uzun müddət Hirada qalmağa başlamışdı. Miladi təqvimlə 610-cu il idi. Aylardan Ramazan, günlərdən Qədr gecəsi idi. O gecə fərqli bir gecə idi. Sanki bütün məxluqat illərdir nəfəsini tutaraq həsrətində olduğuna qovuşmaq anını gözləyirdi. Səmanın *əmini* olan Cəbrayıl yerin və ərşin *əmini* olan Peyğəmbərimiz ﷺ ilə qovuşmağa, ağır bir söz və vəzifəni ona çatdırmaq üçün gəlirdi. Ən-Nur olan Allahın mesajlarını gətirərək, aləmi qaranlıqdan aydınlığa çıxartmaq üçün gəlirdi. Cəbrayili-Əmin, Muhəmmədul-Əminə ən böyük etibar və etimadın mənbəyi olan ilahi vəhyi çatdırmaq üçün gəlirdi.

Gözlənilən an gəlmiş, göyün bərəkətli süfrəsi insan oğlunun önünə açılmış, Allah (cəllə cəlaluhu) bəşərə xitab edərək yenidən insan oğlu ilə vəhy vasitəsilə danışmağa başlamışdı.

Cəbaryıl gəldi və Allahın ilk əmrini gətirərək ***"İqra / Oxu"*** **-** dedi. Oxuma bilməyən Muhəmmə-

dul-Əmin əmrin tam mənası ilə nəyi qəsd etdiyini anlaya bilməmişdi. ***"Mə ənə bi qari / Mən oxuya bilmirəm"*** - demişdi. Əslində Cəbrayili-Əminin Muhəmmədul-Əmindən istəyi fərqli idi. Bu əmr üç dəfə təkrarlanmış, sonra da Cəbrayili-Əminin lisanından ilk ayələr eşidilmişdi.

Ələq surəsinin ilk ayələri…

**"Oxu! Yaradan Rəbbinin adı ilə oxu.**

**O, insanı laxtalanmış qandan yaratdı.**

**Oxu! Sənin Rəbbin ən böyük kərəm sahibidir.**

**O Rəbbin ki qələmlə (yazmağı) öyrətdi.**

**(O Rəbbin ki) insana bilmədiklərini öyrətdi."** (Ələq, 96/1-5)



Peyğəmbərimiz ﷺ vəhyin bu ilk sözləri altında əzilmiş, tər içində qalmış, nə edəcəyini bilməmiş, bu ağır və çətin vəzifənin altında bir bəşər olaraq sıxıntıların ən böyüyünü yaşamağa başlamışdı. Çətinliklə də olsa mağaradan çıxaraq aşağıya tərəf enməyə çalışmışdı. Yeridikcə halı daha da pisləşir, qeybdən bəzi səslər eşidir, daşın, ağacın, torpağın, bir sözlə bütün varlığın dilindən:

*"Əs sələmu aleykə, ya Rəsulallah! / Sənə salam olsun, ey Allahın elçisi!"* nidalarını eşidirdi.

Artıq o, Əbu Talibin yetimi deyil, Muhəmməd b. Abdullah deyil, Allahın aləmə seçib göndərdiyi son elçi idi. O, artıq Rəsulallah idi. O, artıq Nəbiyyullah idi.

Peyğəmbərimiz ﷺ çətinliklə Hiradan aşağı endi. Bu ruh halı ilə haraya getməli, kimdən bu halına dair məlumat almalı idi? Kim onu təsəlli edib kömək edə bilərdi? Peyğəmbərimizin qarşısında gedə biləcəyi dörd ünvan vardı.

Əmisi Əbu Talibin yanına gedə bilərdi. Çünki əmisi yaşlı və təcrübəli bir şəxs idi. Dünya görmüş, saçı-başı ağarmış, minlərlə hadisələrə şahid olmuş və üstün zəkasıyla nə ilə qarşılaşmışsa, hamısını həll etmişdi. O yaşına qədər də əmisi hər zaman ona dəstək olmuş, həmişə əlindən gələn köməyi qardaşı oğlundan əsirgəməmişdi. Buna görə də Peyğəmbərimiz ﷺ onun yanına gedə bilər, başından keçənləri ona danışa bilərdi.

İkinci ünvan olaraq dostu, sirdaşı Əbu Bəkrin yanına gedə bilərdi. Əbu Bəkr Peyğəmbərimizdən ﷺ iki yaş kiçik olmasına baxmayaraq çox qabiliyyətli bir şəxs idi. Bir çox sahədə elm sahibi idi, xüsusilə nəsəb elminə olduqca vaqif idi. Amma hamısından ziyadə o möhtəşəm bir dost və sirdaş idi. Peyğəmbərimiz onun yanına gedə bilər, başından keçənləri onunla bölüşər, dərdinə dərman olacaq şeyləri onun yanında axtara bilərdi.

Üçüncü ünvan olaraq Məkkənin ən böyük və ən bilikli adamlarından biri olan Varaqa b. Növfəlin yanına gedə bilərdi. O, sanki yeriyən bir kitabxana idi. Keçmiş bütün ilahi kitablara vaqif, olduqca ağıllı və təcrübəli bir şəxs idi. Onun yanına gedə bilər, başına gələnləri ona danışar, onun verdiyi məsləhətlər sayəsində başına gələnləri aydınlaşdıra bilərdi.

Dördüncü və son ünvan olaraq xanımı, həyat yoldaşı və sirdaşı Xədicəsinin yanına gələ bilərdi. Ürəyindəki fırtınaları Xədicənin limanında sakitləşdirə bilərdi. Və Peyğəmbərimiz ﷺ digər üç ünvana getməyi deyil, birbaşa Xədicəsinin yanına gəlməyi seçdi. Nə üçün? Çünki Hz. Xədicə bir həyat yoldaşı kimi etibar qazanmışdı. Peyğəmbərimizə on beş illik evliliyi boyunca sirdaş və yoldaş olmuşdu. Bir hadisə ilə qarşılaşdıqda təlaşlanmamış, məsələni axıra kimi dinləmiş və ən məqbul rəftar necə olmalıdırsa, elə davranmışdı. Beləliklə də həyat yoldaşına həm kömək etmiş, həm də ürəyindəki fırtınaların sakitləşməsini təmin etmişdi. Belə bir etibar və etimad Peyğəmbərimizi ən çətin anında başqa yerə deyil, birbaşa Xədicəsinin qapısına gətirmişdi.



Peyğəmbərimiz titrəyir, bədənindən soyuq tərlər axırdı. Çətinliklə evə çatmış və çatar-çatmaz Xədicəsinə: “Zəmmiluni... Zəmmiluni.../Məni örtün... Məni örtün..” - deyə bilmişdi. Başını Xədicəsinin dizinə qoyaraq saatlarla durmuş, Xədicə anamız isə tək bir söz söyləmədən, Peyğəmbərimizin özünə gəlməsini gözləmişdi. Daha sonra Peyğəmbərimiz hadisənin şokunu bir az da olsa üzərindən atmış və başına gələnləri Xədicəsinə bir-bir danışmışdı. Xədicə anamız onu diqqətlə dinləmiş, gözlərini Peyğəmbərimizin gözlərinə dayayaraq, o mübarək dodaqlardan çıxan kəlmələri zehninə yazmağa başlamışdı. Peyğəmbərimizin ﷺ sözü bitincə danışma sırası evin sultanına gəlmişdi. Sizcə Hz. Xədicə nə demişdi? Görəsən bəzilərinin etdiyi kimi ərinin başına gələn çətin bir hadisəni bəsitə almış, fikir verməyərək “bu onun hər zamankı halıdır” deyib keçmişdimi? Yoxsa başından edirmiş-

cəsinə "keçər, keçər" deyib məsələni bağlamaq istəmişdi? Yoxsa qışqırıb-bağırmağa başlamışdı? Xeyr, əsla… Bunların heç biri deyil…

O, Xanımlar Aləminin Sultanıdır. Sultana ancaq sultanlıq yaraşar. Hz. Xədicə orada tarixə düşəcək çox önəmli sözlər söyləyəcəkdi.

Dedi: *"Əsla narahat olma, ey Muhəmməd! Allah sənin haqqını heç bir zaman hədər etməyəcəkdir."* Sözün əvvəlində Peyğəmbərimizin ﷺ ürəyindəki fırtınaları sakitləşdirmək üçün belə bir cümlə lazım idi. Xədicə anamız da bu cümlə ilə başladı sözlərinə və sonra da mələkləri belə heyran qoyacaq qısa, amma Muhəmmədi əxlaqı aləmlərə nümayiş etdirəcək cümlələri sıraladı:

*"Sən, qohumların haqqını qoruyursan.*
*Yetimlərin əlindən tutursan.*
*Ehtiyacı olanların ehtiyaclarını qarşılayırsan.*
*Qonaqlarına hər cür ikram edirsən.*

*Haqqın yanında yer alır, haqqın bərqərar olması üçün çalışırsan."* (Buxari, *Bədil-Vəhy*, 3; İbn Sad, *Təbaqat*, c.1, s.195)

Bu qısa, amma mühim cümlələr Xədicə anamızın Hz. Muhəmmədi ﷺ nə cür doğru və kamil olaraq tanıdığının ən böyük dəlilidir. Burada Xədicə anamızın böyüklüyünü, müdrikliyini və mətanətini görürük. Ancaq burada çox vacib bir nüans var. On beş il eyni yastığı bölüşdüyü, hər halına və vəziyyətinə şahid olduğu ərini tanıtdığı zaman dilindən bu cür ifadələrin çıxması çox önəmlidir.

Bir an özümüzü belə bir mənzərənin içərisində təsəvvür edək: Başımıza ağır bir hadisə gəlsə, ilk olaraq evimizdəki xanımımız ilə paylaşarıqmı? Yoxsa ən axırda onları xəbərdar edərik? Ya da biz dərdlərimizi evimizin xanımı ilə bölüşəndə Xədicə kimi bir anlayışlamı qarşılaşarıq, yoxsa evdəki abu-havanın bir anda dəyişdiyinə şahid olarıq? Bəlkə də dediyimizə min dəfə peşman olub özümüzü qınamağa başlayarıq. Ya da bir nəfər bizim haqqımızda həyat yoldaşımızdan soruşsa, neçəmizin yoldaşı bir az əvvəl Xədicənin dilindən eşitdiyimiz o uca əxlaqa dair xüsusiyyətlər saya bilər.



Belə bir nübuvvət tacı, ancaq özündə və sözündə təmiz olan bir yuvaya yaraşar, belə bir evə layiq görülərdi. Məhz belə də oldu. Doğrudur, risalət vəzifəsi *xatəmən nəbiyyin/peyğəmbərlərin sonuncusu* olan Peyğəmbərimiz ﷺ ilə möhürlənib sona çatdı. Lakin risalətin mesajının insanlara çatdırılması baxımından Hz. Muhəmmədə ﷺ könül verdiyini iddia edənlər bu məsələdə böyük bir məsuliyyət daşıyırlar. Həmin məsuliyyət isə budur ki: Risalətin mesajlarını başqalarına çatdırmağa çalışanlar, görəsən nə qədər onu təmsil edə bilirlər? Bu vəzifəni layiqi ilə yerinə yetirə bilirlərmi? Unutmayacağımız bir həqiqət var ki, bütün müsəlmanlar təbliğ vəzifəsi ilə mükəlləfdirlər. Ancaq təbliğ layiqli şəkildə təmsil etməklə olur. Təmsil etməyin haqqını ödəyə bilməyənlər, nə cür təbliğ edə bilərlər ki?

Xədicə anamız ilk vəhy nazil olduqdan sonra, dilindən çıxan hər bir cümlə ilə Peyğəmbərimizin ﷺ ürəyindəki atəşin üzərinə su səpir, hər bir cümləsi ilə qəlbindəki fırtınaları dindirir və dalğaları sakitləşmiş bir okeana çevirirdi.

Xədicə həyat yoldaşını bu cümlələrlə təsəlli etdikdən sonra əsl söyləyəcəyi sözü dilə gətirərək deyirdi: *“Müjdələr olsun, ey əmim oğlu! Olduğun yerdə səbat et. Nəfsimi qüdrətində tutan zata and olsun ki, sən gələcək son peyğəmbərsən. Mən də sənin peyğəmbərliyini təsdiq edərək sənə inanan ilk insan oluram.”* (Mavərdi, *Aləmun-Nübuvvə*, c.1, s.275)

Hz. Xədicə (radiyallahu anhə) heç tərəddüd etmədən, ən kiçik şübhəyə yer qoymadan on beş ildir özünə sirdaş bildiyi Muhəmmədi ﷺ artıq bir də peyğəmbər olaraq da qəbul edirdi.

Xədicə anamız bu sözlərdən və iman adına edilən təsdiqdən sonra bir də həyat yoldaşının başına gələn bu fövqəladə halları, bu işləri yaxşı bilən biri ilə bölüşmə ehtiyacı hiss edir. Bu səbəblə, Peyğəmbərimizdən ﷺ icazə alaraq, birbaşa o günlərdə yaşı doxsana çatmış əmisi oğlu Varaqa b. Növfəlin yanına gedir. Hz. Xədicə Peyğəmbərimizin ﷺ başına gələnləri bir-bir Varaqaya danışır. Varaqa Xədicəni dinlədikcə, yaşlı bədəni gəncləşir, taqətsiz dizlərinə

taqət, gücsüz dilinə güc gəlirdi. Varaqa daha çox dayana bilmiyərək: *“Quddus, Quddus, Subbuh, Subbuh!.”* - deyə qışqırmağa başlayırdı. Yaşlı Varaqa, gəncləşən bədəni ilə belə deyirdi: *“Ey qızım! Əgər danışdıqların doğru isə, nəfsimi qüdrətində tutan zata and olsun ki, ərin Muhəmmədə gələn elçi, daha əvvəl Musaya və İsaya gələn Namusu Əkbərdir. Şübhəsiz ki, Muhəmməd bu ümmətin son peyğəmbəridir. Get bu söylədiklərimi ona xəbər ver. Ona de ki, narahat olmasın, qorxmasın və bu ağır vəzifə üçün səbat göstərsin.”* (İbn Hişam, *Sirə*, c. 1, s. 315)



Xədicə anamız onsuz da buna ilk başdan inanmışdı, ancaq əmisi oğlu Varaqadan eşitdikləri sözlərlə bir daha arxayın olmuş və mütmain bir qəlb ilə Peyğəmbərimizin ﷺ yanına geri qayıtmışdı. Varaqanın dediklərini onunla bölüşmüşdü.

Peyğəmbərimiz yavaş-yavaş hadisənin təsirindən çıxmağa çalışırdı. Bir müddət sonra qalxdı və Kəbəyə getdi. Təvaf etdi və bir kənara çəkilib oturdu. Həmin anda da Varaqa Kəbəyə gəlmişdi. Peyğəmbərimizin orada olduğunu görüb sevindi, dərhal yanına gəldi. Varaqa yaşlı bir qoca idi. Ancaq buna baxmayaraq böyük bir ədəblə Peyğəmbərimizin alınından öpdü və sanki *“İndiyə qədər haradaydın?”* - deyirmişcəsinə Peyğəmbərimizə ﷺ böyük bir məhəbbətlə baxdı və dedi: *“Ey əmimin oğlu! Qızım Xədicədən olanları eşitdim, ancaq bir də şəxsən sənin ağzından eşitmək istəyirəm.”* Peyğəmbərimiz başına gələnləri danışmağa başladı. Varaqa hər eşitdiyi cümlə ilə özünü itirir, illərdir gözlədiyi günün gəlməsinin həyəcanı ilə Xədicəni dinləyərkən dediyi

sözləri təkrar edir, *"Quddus, Quddus, Subbuh, Subbuh!."* - deyirdi.

Yaşlı Varaqa, deyilənləri dinlədikdən sonra Peyğəmbərimizə ﷺ deyirdi: *"Ey Muhəmməd! Şübhəsiz ki, sən, bu ümmətin seçilmiş son peyğəmbərisən. Daha əvvəl Musaya və İsaya gələn Namus sənə də gəlmişdir. Bunun üçün səbat göstər, çünki başına çox şey gələcək. Qövmün səni yalanlayacaq, sənə hər cür işgəncə verməkdən geri durmayacaq və səni vətənindən çıxarıb qovacaqlar, hətta səninlə savaşacaqlar."* (İbn Hişam, *Sirə*, c.1, s.316; Təbəri, *Tarix*, c.2, s.207)



Peyğəmbərimiz ﷺ bu sözləri eşitdikdə heyrətə gəlir, bu günə qədər heç bir problem yaşamadığı, hər zaman sevgi və hörmət gördüyü qövmünün nə cür ona bir anda belə düşmən olacaqlarını başa düşə bilmirdi. Amma Varaqa əvvəlki peyğəmbərlərin gətirdikləri mesajlara qarşı qövmlərinin necə münasibət göstərdiklərini yaxşı bilirdi. Risalət təbliğini nələrin gözlədiyinə çox yaxşı vaqif idi. Çünki Risalət təbliği Haqdan idi, haqq və həqiqət idi. Haqqın ayağa qalxması, batilin yox olması deməkdir. Təbii ki, batilin yox olması, batilin tərəfdarlarını narahat edəcəkdi. Onlar haqqın səsindən narahat olacaq, eşitməmək üçün əllərindən gələn hər şeyi edəcəkdilər. Bunun üçün də Varaqa gələcəyi görürmüş kimi Hz. Peyğəmbərə ﷺ indidən hazırlanmasını, bu çətinliklərdən xəbərdar olmasını təlqin edirdi.

Varaqa sözlərini əbədi nicatına vəsilə olacaq bu sözlərlə bitirirdi: *"Kaş ki, o günlərə qədər yaşaya biləydim və gücüm olaydı. Qövmün səni vətənindən*

*sürgün edib çıxaracaqları gün sənə dəstək ola biləydim."* (İbn Hişam, *Sirə*, c.1, s.316; İbn Kəsir, *əl-Bidayə*, c.3, s.13)

Bu sözlərdən sonra Varaqa təkrar Peyğəmbərimizə sarılacaq, şəfqət və həsrət ilə onu bir daha alnından öpəcək və bir neçə həftə sonra vəfat edəcəkdi. Sanki qədər ona Muhəmmədi ﷺ görüb dəstəkləmə anına qədər möhlət vermiş, Peyğəmbərimizi görüb təsdiq etdikdən sonra vəzifəsi tamamlanmış və artıq qəbir aləminə doğru səfər etmişdi.



Sonralar həm Xədicə anamız, həm də digər müsəlmanlar Varaqanın axirətdə halının necə olacağını öyrənmək üçün Peyğəmbərimizə sual verəcəkdilər. Peyğəmbərimiz onun risaləti təsdiq etdiyini xəbər verərək Varaqanın cənnətdə olduğunun müjdəsini verəcək və deyəcəkdi ki: **"Mən Varaqanı cənnətin vadilərində gördüm və üzərində sündüsdən (qızıl və gümüş saplardan ibarət naxışlı ipək qumaş) bir libas/paltar var idi."** (Heysəmi, *Məcməuz-Zəvaid*, 9/416)

Bundan sonra artıq Hz. Muhəmməd ﷺ ilə Xədicə anamızın həyatında yeni bir dövr başlayırdı. On beş il davam edən peyğəmbərlikdən əvvəlki həyatları, indi peyğəmbərlik ilə birlikdə əlavə olaraq on il də davam edəcəkdi.

İlk vəhyin nazil olmasından bir müddət sonra Cəbrayıl bir daha gəlir, Peyğəmbərimizi ﷺ də yanına alaraq, Məkkənin xaricində bir yerə aparır və dabanını yerə vuraraq oradan su çıxmasını təmin edir. Orada Peyğəmbərimizə əvvəl dəstəmazı, sonra

da namazı öyrədir və ilk dəfə orada bərabər iki rükət namaz qılırlar. (İbn Hişam, *Sirə*, c.1, s.324)

Artıq Allah Rəsulu ﷺ Rəbbinə nə cür ibadət edəcəyini öyrənmiş, Muzzəmmil surəsinin nazil olmasına qədər də, iki rükət sabah, iki rükət axşam olmaq üzrə namaz qılmış, daha sonra bu namazlara gecə namazını da əlavə etmişdi. Merac hadisəsində isə beş vaxt namaz ümmətinə fərz qılınacaqdı.

Peyğəmbərimiz bu yeni ibadətin sevinci və həyəcanı ilə Xədicəsinin yanına gəldi və Cəbrayıldan öyrəndiyi şəkli ilə Xədicəsinə namazı və dəstəmazı öyrətdi. Artıq Muhəmmədin ﷺ evi namazlı bir ev idi. Namaz dinin dirəyi idi, onu ayaqda tutub qoruyan, dini qoruyacaqdı. Onu yıxan və qorumayan isə dinini yıxmış olacaqdı.

Burada belə bir sual ortaya çıxır: Nə üçün namaz bu qədər tez bir zamanda Peyğəmbərimizin ﷺ həyatına daxil oldu? Namaz, onu qılana necə təsir edir ki, imandan sonra ən böyük həqiqət olaraq mömin insanın ayrılmaz bir parçası olur?

Hər şeydən əvvəl bunu deyək ki, risalət vəzifəsi çətin bir vəzifədir. Bu işin çətinliyini Varaqa dilə gətirmişdi. Bu işin içində sürgün var, işgəncə var, əziyyət var, təzyiq var, qınama var, ələ salınma var, əlindəki bütün imkanları itirmə var və hətta ölüm belə var... Məhz bu qədər çətin bir vəzifəni yerinə yetirə bilmək üçün, insanın ayaqlarının yerə çox sağlam basması şərtdir. Daha doğru bir ifadə ilə desək, onu dik tutacaq, müvazinətini itirməməsini təmin edəcək güclü bir mənəvi iradəyə ehtiyac var. *Namaz mömin insanın iradə təlimidir*. Bu təlimdən məhrum

olanların yıxılması hər an mümkündür. Ayaq üstə dura bilənlər, ən birinci təzimin həqiqi mənada kimə ediləcəyini öyrənərlər. Bunun üçün də namaz, sahibinə qorxusuz bir qəlb, təmənnasız bir duruş və dinc bir zehn qazandırır.

Allah Rəsulu ﷺ namaz ilə bunları qazanacaq, gün gələcək əqidəsindən imtina etməsi üçün edilən təkliflərə: **"Günəşi sağ əlimə, ayı da sol əlimə versəniz belə, mən bu işdən əl çəkmərəm"** - deyəcəkdi.

Namaz Xədicə anamızın da ayaqlarını sağlamlaşdıracaq, sarayların, ən gözəl məskənlərin nazlı sultanı, əlindəki bütün var-dövləti İslam üçün xərcləyib, çadırlarda qalmağa başlayacaq, ancaq nə vaxtsa "kaş ki, etməsəydim" - deyə bir peşmançılığa da yol verməyəcəkdi.



Namaz bu xoşbəxt evin dirəyi olmuşdu. Xədicə anamız xanımlar aləminin iftixarı olaraq bütün kişiləri belə qısqandıracaq bir fərqlilik ilə həm Hz. Muhəmmədi ﷺ ilk təsdiq etmə şərəfinə nail olmuş, həm də onun arxasında duraraq ilk namaz qılma fürsətini əldə etmişdi. Bu şərəf və üstünlük xanımlara bəs edər, hətta artar belə... İlk olmaq fərqlənməkdir, ilk olmaq şərəfdir və ilk olmaq bambaşqa bir ikramdır. Xədicə anamız ilk olan hər şeyi əldə etmişdi.

O, Allah Rəsulunun ilk xanımı idi.

O, Allah Rəsulunun uşaqlarının ilk anası idi.

O, Allah Rəsulunun ilk yoldaşı idi.

O, Allah Rəsulunun ilk sirdaşı idi.

O, Allah Rəsulunu ilk təsdiq edən idi.

O, Allah Rəsulunun arxasında ilk namaz qılan idi.

O, Allah Rəsulunun yanında risalətin təbliğinə malı və canı ilə yardım edən ilk insan idi.

O, Allah Rəsulunun yanında on il mücadilə içərisində olan ilk mücahidə idi.

Və daha nələr, nələr…

O, ilklərdən, ən öndəkilərdən, müqəddəs halqanın ən başında olanlardan idi.



Aradan bir gün keçməmişdi ki, Xədicə anamız böyük bir xuşu içərisində Peyğəmbərimizin arxasında namaza durmuşdu. Elə bu an evin o günlərdə beş illik sakini olan on yaşındakı Əli onları gördü. Bir də gördü ki, bir yönü ilə anası və atası olan Muhəmməd ﷺ və Hz. Xədicə heç bu günə qədər görmədiyi bir şəkildə bəzi hərəkətlər edirlər. Ləyaqət və şərəf timsalı olan Əli bu hərəkətlərdən çox təsirlənmişdi. Muhəmməd ilə Xədicə anamız rükuya əyildikdə Əli tam fərqli duyğulara yelkən açmış, onlar səcdəyə getdikdə, Əli də, sanki onların arxasındaymış kimi o səcdədən ləzzət almışdı.

Əli, Allah Rəsulunun namazını bitirməsini gözlədikdən sonra yanına yaxınlaşdı. Əmisi oğlu Muhəmməddən bir az əvvəl etdiyi hərəkətlərin mənasını soruşdu. Allah Rəsulu Əlini qarşısına alaraq danışmağa başladı… Peyğəmbərimiz sanki böyük adam kimi Əliyə ciddiyət ilə hadisələri danışır, Əli

isə böyük bir müdriklik ilə düşünərək danışılanları dinləyir, başa düşmədiyi şeyləri bir daha soruşurdu.

Nəhayət Peyğəmbərimiz ﷺ Əlini bu yeni dinə dəvət etdi. Əli Peyğəmbərimizdən düşünmək üçün izn istədi. Söhbət on yaşındakı bir uşaqdan gedir. Həmin an həyəcana gəlib hər deyiləni qəbul edə bilər, bir müddət sonra da peşman ola bilərdi. Lakin qarşımızda duran adi bir uşaq deyil, gələcəkdə vəlayət taxtının sultanı olacaq İmam Əlidir. Və Əli müəllimləri olan Muhəmməd və Hz. Xədicədən mühakimənin önəmini öyrənmiş, mömin insanın ən böyük zinətinin mühakimə etmə qabiliyyəti olduğunun dərsini almışdı.



Peyğəmbərimiz, Əlinin fikirləşmək üçün zaman istəməsini təbəssümlə qarşılamış və ona izn vermişdi.

Hz. Əli o gecə sabaha qədər düşünmüş, səhərin erkən saatlarında Peyğəmbərimizin ﷺ yanına gəlmiş və Peyğəmbərimizdən dünən danışdıqlarını təkrar etməsini istəmişdi. Peyğəmbərimiz də bu istəyi yerinə yetirmiş və bütün olanları başdan sona qədər bir daha danışmışdı. Peyğəmbərimizin sözü bitər-bitməz Əli *“Lə iləhə İlləllah, Muhəmmədun Rəsulallah ”* – deyərək o müqəddəs halqanın ilklərindən olma şərəfinə nail olmuşdu. (İbn Hişam, *Sirə*, c.1, s.2360)

Artıq Hz. Əli də, həyatı boyunca bir daha tərk etməyəcəyi Muhəmmədin ﷺ arxasında başda namaz olmaq üzrə, həyatın hər sahəsində yerini alırdı.

O ilk günlərə aid bir xatirəni Afif b. Ömər bizə nəql edir. Deyir ki: “Mən cahiliyyə dövründə ticarətlə məşğul olan bir adamdım. Ticari bir məqsədlə

Məkkəyə gəlmişdim. Bir ara Əbdulmuttəlibin oğlu Abbas ilə oturub söhbət edirdim. Bir də gördüm ki, orta yaşlı bir adam, arxasında bir xanım, onun arxasında on-on iki yaşlarında bir uşaq gələrək Kəbənin qarşısında durub o günə qədər heç görmədiyim bir şəkildə ibadət etdilər. O mənzərədən çox təsirləndim və Abbasdan onların kimlər olduğunu soruşdum, Abbas: "Öndəki qardaşım Abdullahın oğlu Muhəmməd, arxasındakı onun xanımı, digəri isə qardaşım Əbu Talibin oğlu Əlidir. Muhəmməd özünə peyğəmbərlik gəldiyini iddia edir. Etdikləri ibadət isə, bu yeni dinin onlara əmr etdiyi namazdır" - dedi. Mən çox təsirlənməyimə baxmayaraq, o gün ancaq seyr etdim." (Əhməd b. Hənbəl, *Müsnəd*, 1/209; İbn Sad, *Təbaqat,* c.8, s.18)



Afif b. Ömər bu hadisənin üzərindən təxminən iyirmi bir il keçdikdən sonra Məkkənin fəthi günü müsəlman olur. İman etdikdən sonra bir kənara çəkilir və göz yaşı tökür. İnsanlar iman edib sevinəcəyi halda ağlayan Afifin o halına təəccüb edirlər... Və ağlamağının səbəbini soruşarlar. Afif deyir ki: *"Mənim qaçırdığım fürsəti bir bilsəniz... O gün Allah Rəsulunun arxasında sadəcə Xədicə və Əli var idi. Əgər o gün iman etsəydim, yer üzünün dördüncü müsəlmanı mən olacaqdım."* (Hakim, *Müstədrək, 3/201)*

Afif b. Ömərin əldən verdiyi ilk olma şərəfinə Xədicə anamız və Hz. Əli nail olmuşdular. Onlar yer üzünün ən bəxtiyar insanları olaraq bu böyük ikramın sahibləri olmuşlardı. Onlar, çətin və ağır bir vəzifəyə talib olmuşdular.

Nübuvvət və risalət çətin vəzifələrdir. Fədakarlıq istəyirdi. Evdən, işdən, rahatlıqdan, hətta candan belə keçməyi gərəkdirirdi. Nübuvvətin günəşi olan Allah Rəsulu ﷺ onsuz da bütün bunların hamısından keçmişdi. Amma nəticədə o da bir insan idi. Bəzi hadisələrdən təsirlənir, bəzi hadisələr qarşısında həyəcanlanır, üzülür, sıxılır və bəzən ana kimi şəfqətli bir ürəyə, bəzən də vəfalı bir dost kimi ona dəstək olacaq birinə ehtiyac hiss edirdi.

Belə anlarda Xədicə anamız, Peyğəmbərimizə ﷺ həm yar idi, həm yardımçı... Həm xanım idi, həm dost... Həm ana kimi şəfqətli, həm də bir dost kimi vəfalı idi. Necə ki peyğəmbərlikdən əvvəl Allah Rəsulunu on beş il şəfqət dolu qanadlarının altına almışdısa, indi bu qanadlarını daha da açır, sanki canını cananının həyatına fəda edirdi.



Bu on il içərisində Peyğəmbərimizin ﷺ həyatının bütün sahəsində Xədicə anamızın bir yeri vardı. İlk vəhydən sonra bir müddət vəhy gəlmədiyi üçün bu dövrə "fətrət dövrü" deyilir. Həmin dövr Peyğəmbərimiz üçün çox çətin idi. Vəhyin gəlişi gecikdikcə Allah Rəsulunun ﷺ taqəti tükənir, sıxılır və kədərlənirdi. Bu çətin zamanda eyni səs, eyni nəfəs, eyni cümləni təkrarlıyırdı: *"Ya Rəsulallah! Qorxma, məyus olma, kədərlənmə! Allah səni əsla məyus etməyəcəkdir."*

Peyğəmbərimiz bu səsi eşidincə rahatlıq tapır, Allaha (cəllə cələluhu) şükür edir, "nə yaxşı sən varsan, evimin sultanı", - deyib Xədicəsinə olan məhəbbətini dilə gətirirdi.

Bu dövr bitər-bitməz vəhy yaz yağışı kimi Muhəmmədin ﷺ evinə yağmağa başlıyırdı. Hər gələn vəhy bəşəriyyətin dərdi ilə dərdlənmiş bu ülvi evin hüzn havasını bayram sevincinə çevirirdi. Xədicə anamız əri və öndəri Muhəmmədin dilindən ilk dəfə **"İqra bismi rabbikəllazi xaləq / Oxu! Yaradan Rəbbinin adı ilə oxu..."** əmrini eşitmişdi. İndi isə **"Nun vəl qaləmi və mə yəsturun / Nun, qələmə və onun yazdıqlarına and olsun!"** mesajını qəbul etmişdi. "Oxu" və "qələm" ikisi də elmin əlamətlərindən, alətlərindəndir. Aləti onlara xatırladan ilahi qüdrət elmə diqqət çəkirdi. "Oxuyun, yazın, araşdırın, elm sahibi olun." - deyirdi. Bəs görəsən sonra "elmi belinizdə bir yük olaraq daşıyınmı", deyilir? Xeyr, əsla! Bu iki surədən sonra gələn digər iki surəyə qulaq asaq:



**"Yə əyyuhəl muzzəmmil, qumil leylə illə qalilə... / Ey örtülərə bürünən! Gecənin az bir qismi müstəsna ibadət üçün qalx..."**

**"Yə əyyuhəl müddəssir! Qum fə ənzir... / Ey (libasına) bürünüb sarılan! Qalx və (insanları) xəbərdar et..."**

İlk enən dörd surədə üç mühim kəlməyə diqqət yetirək: "Oxu", "qələm" və "qalx!" Oxumaq ilə qələmi bir kəlmədə cəm etsək, qarşımıza iki kəlmə, daha doğrusu iki fel çıxır: Elm və əməl

Allah Rəsulu ﷺ vəhyin bu əmrlərini almışdı. O, elm yolunda Hira mağarasında yetişirilirdi. Hər Hira təcrübəsi Peyğəmbərimizdə tam fərqli bir əqli, ruhi, mənəvi tərəqqilərə səbəb olurdu. Çünki o, Hirada

əqlin və ruhun nuru olan təfəkkür ibadətini edir, düşünür, düşündükcə də dərin dəryalara yelkən açırdı.

İlk vəhyin nazil olmasından sonra da bir müddət Peyğəmbərimiz ﷺ Hiraya yönələcək, hər getdiyində də Xədicəsinin yenə dəstəyini görəcəkdi. Bu zaman içərisində də Xədicə anamız Peyğəmbərimizə 621 metr yüksəklikdəki qayalarla örtülü o dağa azuqə daşıyırdı. Peyğəmbərimiz bəzən Hiranın zirvəsindən, dağın ətəklərində vəfakar xanımının gəldiyini görüncə səslənir, sən gəlmə sultanım, mən gəlirəm, deyərək Xədicəsini yormamaq üçün özü aşağı düşürdü.



Bir gün yenə Xədicə anamız mağaraya yemək aparırdı. Hava isti, yol məşəqqətli, anamız isə yaşlı idi. Qan-tər içərisində mağaraya yaxınlaşarkən Cəbrayıl (aleyhissəlam) Peyğəmbərimizə ﷺ Xədicənin gəldiyini xəbər verdi. Dedi: "*Ya Rəsulallah! Gələn Xədicədir. Rəbbim çəkmiş olduğu sıxıntı və göstərmiş olduğu fədakarlığa qarşı ona salam söyləyir və onu cənnətdə içərisində nə bir gurultu, nə bir yorğunluq olan incidən bəzədilmiş bir sarayla müjdələyir.*"

Peyğəmbərimiz ﷺ Xədicəsi gəldiyi zaman ayağa qalxaraq ona bu böyük müjdəni verdi. Xədicə bu müjdəyə sevindi, bu salam və mükafata bu cür qarşılıq verdi: *"Salam Allahdır. Salam Ondandır. Salam Allaha, Onun böyük mələyi Cəbrayıla və sənin üzərinə olsun, ya Rəsulallah."* (İbn Əbdilbərr, *əl-İstiab*, c.4, s.381)

Xədicə anamız "İqra" və "Qələm", yəni elm əmrlərinin yerinə yetirilməsi xüsusunda Peyğəmbərimizə bu cür dəstək olurdu. O, bu əmrlərin təbli-

ğində dəstək olduğu kimi, *"Qum / qalx"* əmrinin də təbliğində dəstək olurdu. Xədicə anamızın Peyğəmbərimizə ﷺ olan sevgisi, əsla ərini risalət vəzifəsindən uzaqlaşdıracaq bir davranışa səbəb olmurdu. Əksinə, Xədicə anamız vəhyin "*Qum/qalx*" əmrlərini eşidincə sanki ərinə: "Ey bəyim! Qalx və irəli addımla, yollar sənindir!" - deyirdi. Peyğəmbərimiz bu çətin və ağır risalət vəzifəsi üçün yola çıxarkən, Hz. Xədicə də bir xanım olaraq əlindən gələn köməyi əsirgəmirdi.

Allah Rəsulunun on üç il davam edən çətin Məkkə illərinin ilk on ilinə şahid olan Hz. Xədicə anamız, bu dövrün üç mühim mərhələsinə şahid olmuş və hər mərhələdə də öz üzərinə düşəni artıqlamasıyla yerinə yetirmişdi.



Məkkəlilərin İslami dəvətə qarşı nümayiş etdirdikləri üç davranış aşağıdakılardan ibarət idi:

1. Fikir verməmək, boş hesab etmək, əhəmiyyət verməyərək öz içərisində səssizliyə məhkum etmək.

2. Ələ salmaq, söz atmaq, hər cür yalan xəbərlə, yüksələn İslam mesajının qarşısını almaq.

3. Fiziki hücumlar etmək, hərəkatın başında olan insanları ortadan qaldırmaq üçün səfərbər olmaq.

Gəlin bu üç mərhələdə də Hz. Xədicənin bütün müsəlmanlara nümunə ola biləcək və onu Xədicətul-Kübra edən örnək həyatındakı misallara nəzər salaq:

**I mərhələ:** Bu mərhələdə Hz. Peyğəmbərin ﷺ mesajlarına əhəmiyyət verilmir, boş hesab edilir, müvəqqəti bir həvəs olaraq görülürdü. Allah Rəsulu insanları, xüsusilə də öz qövmünü Allahın əzabıyla qorxudub, tövhid kimi həyatın ən önəmli həqiqətinə dəvət edərkən, həmsöhbətlərinin qəhqəhə səslərini eşidir, ələ saldıqlarına şahid olur və əzab çəkirdi.

*"Qohumlarını xəbərdar et!"* - ayəsi nazil olduqda Peyğəmbərimiz dəvət üçün qohumlarını toplayaraq onlara ziyafət verir. Hz. Əli gələnlərə xidmət edir, Hz. Xədicə isə yemək bişirərək onları məmnun etmək üçün əlindən gələni edirdi. Allah Rəsulunun ﷺ böyük ümidlərlə təşkil etdiyi məclis, mənfi bir mənzərə ilə nəticələnincə, o həssas ürək üzülür, yaşlı gözləri ilə Xədicəsinin gözlərinə baxırdı. Mərhəmət ümmanı olan anaların anası isə: *"Ey bəyim! Allah səni əsla məyus etməyəcəkdir!"* - deyirdi.

Bu dəvətdən sonra Peyğəmbər evində çox acı bir hadisə yaşanırdı. Peyğəmbərlikdən əvvəl Peyğəmbərimizin əmisi Əbu Ləhəb, iki oğlu Utbə və Uteybəni qardaşı oğlu Muhəmmədin ﷺ iki qızı Ruqiyyə və Ümmü Gülsüm ilə nişanlamışdı. Peyğəmbərimiz qohumlarını yeməyə çağırıb, yeməkdən sonra onları İslama dəvət etdikdə Əbu Ləhəb əsəbləşmiş, "Bizi bunun üçünmü çağırdın, ey əlləri qurumuş?!" - demişdi.

Bundan sonra da həm özü, həm də xanımı olan Ümmü Cəmil artıq düşmənçilikdə sərhəd tanımırdılar. Peyğəmbərimizin keçdiyi yollara tikanlar atır, ona sözlü və fiziki hücumlar edirdilər.

Rəhmli olan Allah (cəllə cələluhu) elçisi Muhəmmədə edilən bu hücumları cavabsız qoymadı və Məsəd surəsi nazil edərək, qiyamətə qədər İslam mesajına düşmən olanları Əbu Ləhəb və xanımının timsalında çox sərt bir dillə qınadı. Bu surə nazil olduqdan sonra Əbu Ləhəb və xanımı sanki dəli oldular. Oğullarını yanlarına çağıraraq Muhəmməd və Xədicəyə bir cəza olması üçün nişanlarını qaytarmalarını istədilər. Uşaqlar da ata və analarının təzyiqi ilə nişanlarını qaytardılar. Artıq Peyğəmbər evində nişanları geri qaytarılmış iki qız var idi. Bu hadisə bir ana olaraq Xədicə anamızı olduqca kədərləndirmişdi. Amma o cəfakar ana, bir gün belə Peyğəmbərimizin ﷺ yanında ağlamamış, üzüntüsünü ona bəlli edərək onu da üzmək istəməmişdi. O, bəzən bu hadisələr ağlına gəldiyi zaman üzülür, gözündən yaşlar boşalır, dəsmalla göz yaşlarını qurudur, qaça-qaça Peyğəmbərimizin getdiyi yollara səpilən tikanları götürür, əgər o tikanlardan biri Peyğəmbərimizin ayağına batarsa, ürəyinə batmış kimi acı hiss edir, gözlərini sildiyi o dəsmal ilə həyat yoldaşının qanayan ayaqlarını silirdi.

Bir müddət keçmişdi ki, Affan oğlu Osman Peyğəmbərimizin bu kədərini azaldıb onu təsəlli etmək üçün Ruqiyyə anamıza talib oldu. Allah Rəsulu ﷺ da bu qızını ədəb və həya timsalı olan Osmana verdi. Təzyiqlər dözülməz hala gəldiyində, bu dəfə bir qrup müsəlmana Həbəşistana hicrət etmək üçün icazə vermiş və başda qızı Ruqiyyə olmaq üzrə bir neçə müsəlmanı ora səfər etməsi üçün hazırlamışdı. Peyğəmbərimiz və Xədicə anamız Ruqiyyə və digər müsəlmanları yola salarkən hüznlərin ən böyüyünü

ürəklərində daşımış, Hz. Xədicə isə artıq qızını bir daha görməyəcəyini hiss edərək arxasından göz yaşı tökmüşdü. Bəli, İslami dəvətin ilk mərhələsində məkkəlilərin münasibətinə qarşı, Hz. Peyğəmbərin ﷺ çəkdiyi sıxıntıları xəfiflətmək üçün Xədicə anamızın mövqeyi bu cür olmuşdur.

Bu dövrdə Peyğəmbər evində yeni bir uşağın doğulduğuna şahid oluruq. Peyğəmbərimiz ﷺ və Xədicə anamız Qasımın vəfatından sonra, yenidən bir oğlan uşağına sahib olurdu. Peyğəmbərimiz yeni doğulan bu oğlan uşağına atasının adı olan Abdullah adını qoymuşdu. Abdullah kədərlə dolan evə böyük bir sevinc gətirmişdi. Amma bu sevinc çox davam etməyəcək, altı ya da yeddi aylıqkən, ana və atasına əlvida deyib gedəcəkdi.



Abdullahın vəfatı Peyğəmbər evində ciddi bir üzüntüyə səbəb olmuşdu. Amma qədərə təslim olmaq, verənin də, alanın da Allah olduğu şüuru ilə əhatə olunmuş o evdə, digər çətinliklər mətanət və səbir ilə qarşılandığı kimi Abdullahın vəfatı da eyni şəkildə qarşılanmışdı.

**II mərhələ:** Bu mərhələdə Allah Rəsulunun dilə gətirdiyi mesajın yayılıb sərhədləri aşdığını görən məkkəli müşriklər həyəcana qapılır və bu mesajın qarşısını almaq üçün hər cür söz, yalan, dedi-qodu və iftira kapmaniyaları ilə insanların bu yeni dinə girmələrinə mane olmağa çalışırdılar. Aləmlərə rəhmət olaraq göndərilən Peyğəmbərimizə dəli, sehrbaz, cadugər və kahin deyilməyə, eşidənləri təsir altına alan ilahi kəlamın Allah qatından deyil, kimlərsə tərəfindən Peyğəmbərə öyrədiliyi iddia edilməyə

başlanmışdı. O həssas ürək, bu deyilənlərə görə çox kədərlənir, insanların nicatına vəsilə olmağa çalışan və sanki insanların cəhənnəm əzabı ilə qarşı-qarşıya gəlməmələri üçün, bir pərvanə kimi ətraflarında dolaşan Peyğəmbərimizə ﷺ bu cür sözlərin deyilməsi Xədicə anamızı çox üzürdü. Lakin Xədicə anamız bu üzüntüsünü Peyğəmbərimizə bəlli etməməyə çalışırdı. Peyğəmbərimiz hər gecə yastığa baş qoyduğunda, yastığının ortağı olan analar anası Xədicə anamız ürəyindəki acılara baxmayaraq onu rahatladır, ürəyinə su səpirdi. Peyğəmbərimiz nə qədər çətin vəziyyətdə, nə qədər sıxıntılar içərisində olursa olsun, Xədicəylə baş-başa qaldığı zaman, onun gözlərinə baxdığında bütün dərdlərini unudur, Xədicənin hər kəlməsi və cümləsi onun ürəyinə su səpirdi.



**III mərhələ:** Sözlə olan hücumların sürətlə davam etməsinə baxmayaraq yenə də insanlar bu yeni dinə girir, Muhəmmədin ﷺ dirildən mesajlarına qulaq asır və hər cür şirki rədd edərək tövhidə təslim olurdular. Məkkəli müşriklər baş verənlərdən narahat olurdular. Yüksələn İslam mesajı onların sonu demək idi. Buna görə də İslami təbliğ daha çox yayılmadan qarşısı alınmalı, sürəti kəsilməli, hətta lazım olarsa, öndə gedənlərin səsi qısılmalı, yəni öldürülməli idilər.

Məkkə müşrikləri bütün bunları müzakirə edərək bu qərara gəldilər:

“*Artıq bundan sonra heç kəs Bəni-Haşim və Əbdulmuttəlib oğulları ilə danışmayacaq və aralarında olan bütün əlaqələr kəsiləcəkdir.. Bu vəziyyət Muhəmmədi onlara təslim edəcəkləri vaxta qədər*

*davam edəcəkdir. Nə qız alınıb veriləcək, nə ticarət əlaqələri qurulacaq, nə də ən kiçik bir yardım ediləcəkdir."*

Bu tamamilə bir blokada qərarı idi və məkkəlilər risalət təbliğini bu üsulla yox etmək istəyirdilər. Siyər tarixinə *Şibi-Əbu Talib* mühasirəsi, ya da boykotu adıyla keçən və üç il davam edən bu insanlığa yaraşmayan fəaliyyət səbəbilə başda Peyğəmbərimiz ﷺ olmaqla, müsəlmanların hamısı çox çətin günlər keçirdilər. Belə ki, günlərlə yeyəcək və içəcəkdən məhrum qaldıqları üçün ağac yarpaqları, torpağın içərisinə qarışmış dəri parçaları yedilər.



Bu çətin və ağır günlərdə Xədicə anamız bir gün belə olsun Peyğəmbərimizi tək buraxmadı. Sarayların və gözəl məskənlərin nazlı sultanı, indi çadırlarda yaşamağa məhkum olmuşdu. Amma könlü məmnun idi. Çünki bu çətinliyə Allah və Rəsulu üçün dözürdü. Bu mübarizənin bir macəra olmadığını bilir, bu dünyada Allahın dini üçün çətinlik çəkənlərin, axirətdə necə bir mükafat ilə qarşı-qarşıya gələcəklərini çox yaxşı dərk edirdi.

Hz. Xədicə bütün var-dövlətini bu müddət ərzində Allah yolunda xərclədi. Bu xərclənən mal heç də az bir mal deyildi. Xatırlayırsızsa, kitabın ilk hissələrində demişdik ki, Xədicə anamızın Şama tək başına göndərdiyi ticarət karvanı Məkkənin göndərdiyi karvanların hamısından daha böyük idi. Belə ki, o, inanılmaz bir sərvətin sahibi idi. Evlilikdən əvvəl yaşadığı ev *Radiatul Kəbə,* yəni *"Kəbənin süd qardaşı"* olaraq adlandırılırdı. Amma gəlin görün ki, Xədicə anamız əlindəki bütün imkanları, sərvət və

rahatlığı cənnət qarşılığında Rəbbinə satmışdı. İndi isə çadırda, o yaşına qədər heç cür vərdiş etmədiyi bir həyata məhkum olmuşdu.

Qardaşı oğlu olan Hakim b. Hizam üç il ərzində müxtəlif vaxtlarda dəvəsini yeyəcək və içəcəklərlə yüklüyərək Şibi-Əbu Talib tərəfə göndərirdi. Dəvə gedəcəyi ünvanı çox yaxşı bilirdi və gedərək Xədicə anamızın çadırının qarşısında çökərdi. Xədicə anamız dəvənin üzərindəki yükləri alar, onları mühasirə altında olan müsəlmanlara paylayar və dəvəni qardaşı oğlu Hakimə tərəf geri göndərərdi.

Bu çətin günlərin birində Məkkənin bəzi liderləri Xədicə anamızın qardaşı oğlu Hakim b. Hizamı çağırdılar. Ona dedilər ki: "Get Xədicəyə de ki, evinə geri qayıtsın. Biz onu Əbdulmuttəlib oğullarından saymırıq. Hər nə qədər o Muhəmmədin xanımı olsa belə, bizim yanımızda hər zaman fərqli bir yeri olmuşdur. Bunun üçün ona belə bir imkan veririk."



Hakim Xədicə anamızın yanına gəldi və məkkəlilərin təklifini ona söylədi. Xədicə anamız bir anda ayağa qalxdı və Şibi-Əbu Talibi titirədircəsinə dedi: *"Necə yəni, mən evimə qayıdıb rahat yaşayacam, müsəlmanlar burada öləcəklərmi? Mən evimə qayıdacam, Peyğəmbərimiz burada çətinlik içindəmi qalacaq? Vallahi, nəticəsi ölüm belə olsa, mən nə müsəlmanları, nə də Peyğəmbərimizi tərk edərəm!"*

Xədicə anamızın bu qətiyyəti başda Peyğəmbərimiz ﷺ olmaqla bütün müsəlmanları sevindirmiş, məkkəliləri isə təəccübləndirmişdi. İmanın dəyər və qiymətini bilməyənlər, iman uğrunda verilən əmək

və ömürləri başa düşə bilməzdilər. Onlar da başa düşmədi...

Gün keçdikcə Şibi-Əbu Talibdəki şərtlər ağırlaşır, çətinliklər artır, taqətlər tükənirdi. Xədicə anamız bütün bunlara baxmayaraq, həyat yoldaşının ürəyinə su səpir, onun üzülməməsi üçün əlindən gələni edirdi. Allah Rəsulu ﷺ vaxt aşırı möhtərəm zövcəsinə dönərək deyirdi:

**"Yaxşı ki sən yanımda varsan, ey Xədicəm! Sən olmasaydın, mən bu qədər çətinliyə necə dözərdim?!"**



Üç il davam edən bu boykot daha sonra müxtəlif vəsilələrlə aradan qalxır və məkkəli müşriklər bu insanlığa yaraşmayan mühasirəni dayandırmaq məcburiyyətində qalırlar.

Müsəlmanlar yenicə rahat nəfəs almışdılar ki, daha çətin və ağır hadisələrlə üz-üzə gəldilər. Bu hadislələrin nələr olduğunu son hissəyə həvalə edərək, əsas bir nöqtəyə diqqətinizi çəkmək istəyirik.

Bu hissədə əslində xüsusilə dörd şəxsiyyətdən bəhs etdik. Bu şəxsiyyətlərdən biri qırx yaşında bir kişi, biri on yaşında uşaq, biri doxsan yaşında bir qoca və biri isə əlli beş yaşında o günə qədər doqquz uşaq dünyaya gətirmiş bir ana...

Qarşımızda yaşları fərqli, cinsiyyət və həyatdakı mövqeləri fərqli dörd insan durur. Bu dörd insan da iman uğrunda üzərlərinə nə düşürsə onu edir, əllərindən gələni əsirgəmir və "mən nə edə bilərəm ki?" - demirdilər.

Qırx yaşındakı Muhəmmədə ﷺ düşən vəzifə, risaləti təbliğ uğrunda mücadilə etmək, təbliğ, təlim, təbyin[2], təzkiyə[3] və dəvət üçün çırpınmaq idi.

Əlli beş yaşındakı Xədicəyə düşən vəzifə, mücadilə edən həyat yoldaşının tərləyən alnını silmək, ayağına batan tikanların qanatdığı yaraları təmizləmək, şəfqət və mərhəmətlə onun ürəyində meydana gələn fırtınaları sakitləşdirmək idi.

On yaşındakı Əliyə düşən vəzifə, dəvətdə qonaqlara su ikram etmək, süfrə açmağa kömək etmək, əgər havaya qalxan əllər yoxdursa, əl qaldırıb "Mən varam!" - deyə bilmək idi.

Doxsan yaşındakı Varaqaya düşən vəzifə isə, təcrübə və elmi ilə yardımçı olmaq, heç bir şey edə bilməsə belə, dualarıyla bu yola dəstək olmaq və "Ah... kaş ki, gənc olaydım, sənin arxanda yer ala biləydim!" - deyə təmənna etmək idi.



Deməli, hər kəs bir işi görə bilməz, ancaq hər kəsin görə biləcəyi bir iş vardır. Nə etməli olduğunu düzgün təsbit edənlər, risalət təbliğinin uzaqlara daşınması üçün səylərini ortaya qoya bilərlər.

2. Açıqlamaq, bəyan etmək deməkdir. Peyğəmbərimizin vəzifələrindən biri də Quranı insanlara açıqlamaqdır. (Nəhl, 44)
3. Peyğəmbərimizin digər vəzifələrindən biridir. İç aləmin mənəvi kirlərdən təmizlənməsi deməkdir. (əl-Bəqərə, 151)

Allah Rəsulu ﷺ Məkkə dövründə çox çətin və ağır şərtlər altında risalət vəzifəsini yerinə yetirirdi. Təzyiqlər, işgəncələr, boykotlar, qətllər və daha nələr, nələr... Bütün bu sıxıntılara baxmayaraq Peyğəmbərimizi ﷺ tək təsəlli edən şey, Ərkamın evində, hər gün yeni birinin *Lə İləhə İlləllah* sözlərini deməsi idi.

Nübuvvətin 6-cı ilində Məkkənin iki böyük insanı, iki böyük aslanı Darul-Ərkamda iman etmişdi. Əvvəl aslan ovçusu, səhraların igid insanı Həmzə, sonra da gəzərkən ətrafındakı insanların qəlbinə qorxu salan Ömər iman etmişdi. Bu iki igidin iman etməsiylə artıq İslam mesajı Ərkamın evinin sərhədlərini aşmış, Kəbənin qəmgin divarları ilə qovuşmuşdu. Artıq iman açıq şəkildə dilə gətirilir, bütün bu çətinliklərə baxmayaraq kəlmeyi-tövhid Məkkə küçələrini titrədirdi. Artıq bu dönəm, siyər tarixinə açıq dəvət dönəmi olaraq qeyd ediləcək və Allah Rəsulunun ﷺ həyatında yeni bir dövrün başlamasına səbəb olacaqdı.

Müsəlmanların Şibi-Əbu Talib mühasirəsindən çıxmalarının üzərindən hələ bir ay keçməmişdi və təqvimlər nübuvvətin 10-cu ilini göstərirdi. O günlər Hz. Peyğəmbər ﷺ əlli, Xədicəsi isə altmış beş yaşlarında idi. Bu il siyər tarixinə *Hüzn İli* olaraq

keçəcəkdi. Çünki bu il Allah Rəsulu iki hamisini/ qoruyucusunu itirəcəkdi.

Ən birinci, o gün səksən beş yaşlarında olan əmisi Əbu Talib xəstə yatağına düşdü. Xəstəliyi gün keçdikcə ağırlaşırdı. Allah Rəsulu bir an belə olsun bu fədakar və cəfakar əmisinin yanından ayrılmırdı. Çünki Əbu Talib on il nübuvvətin gəlməsi ilə, otuz il də nübuvvətdən əvvəl, düz qırx il qardaşı oğlu Muhəmmədi ﷺ qorumuşdu. O, imanın ən böyük dəstəkçisi olmuşdu. İslamın ilk illərində, bir gün gördü ki, on yaşında olan kiçik oğlu Əli, Peyğəmbərimizin sağında namaz qılır. Əbu Talib onlara heyranlıqla baxdı. Həmin an iyirmi yaşlarında bir dəliqanlı olan digər oğlu Cəfər yanına gəldi. Əbu Talib Cəfərə dedi: *"Cəfər, qaç sən də Muhəmmədin solunda dayan. Vallahi, Muhəmməd sizi ancaq xeyirə və yaxşılığa aparar."* (Təbəri, *Tarix*, c.2, s.115)



Əbu Talib bax belə biri idi. Qardaşı oğluna qəti şəkildə inanır, onun haqq olduğunu bilirdi, onu canı bahasına da olsa qoruyur amma ona iman etdiyini açıq şəkildə ifadə etmirdi. Deyə bilmərik amma bəlkə o da bunun üçün vəzifələndirilimişdi. Bəlkə açıq şəkildə iman etsəydi, qureyşlilər onun da sözünü dinləməz, onu da ortadan qaldırma yollarını axtarardılar.

Belə bir əmi indi ölüm döşəyindədir. Qureyşin böyüklərinin bir qismi onun baş ucundadır. Qardaşı oğlu Muhəmməd də oradadır. Peyğəmbərimiz ﷺ əmisindən ayrılmanın hüznünü ürəyində daşıyarkən, bir tərəfdən də: **"Əmi, nə olar Lə İləhə İlləllah de. De ki, sənə axirətdə şəfaət edə bilim"** -

deyərək qıvranıb dururdu. Bir tərəfdən Qureyşin böyükləri Əbu Talibə: *"Xeyr, ey Əbu Talib! Atalarının dini üzrə ol..."* - deyərək təlqin edir, digər tərəfdən də Peyğəmbərimiz ona imanı təlqin edirdi. Və Əbu Talib açıq şəkildə iman etmədən bu aləmdən köçdü. Peyğəmbərimiz kədərlənərək göz yaşlarına boğulur, bir tərəfdən əmisini itirmənin, digər tərəfdən də əmisinin imanını açıq şəkildə söyləmədən vəfat etməsinin hüznünü yaşayırdı. Bu ərəfədə digər əmisi Abbas, qardaşı oğlu Muhəmmədə deyir ki: *"Ey Qardaşım oğlu! Əbu Talib can verərkən sənin istədiyin cümləni səssizcə söylədi. Mən eşitdim".* Amma Peyğəmbərimiz ﷺ: **"Mən eşitmədim." -** buyurdu. (İbn Hişam, *Sirə*, c.2, s.265; İbn Sad, *Təbaqat*, c.1, s.99)



Allah Rəsulu ﷺ kədərli bir halda evinə getdi. Evinə çatdığında isə iyirmi beş illik həyat yoldaşının ağır bir şəkildə xəstələndiyini və yatağa düşdüyünü gördü. Peyğəmbərimiz ürəyindəki o acı ilə həyat yoldaşı, analar anası Xədicənin yanına oturdu. Xədicə anamızın xəstəliyi üç gün davam etdi. Peyğəmbərimiz ﷺ bu üç gün boyunca həyat yoldaşının yanından bir an belə olsun ayrılmadı.

Son gün idi. Peyğəmbərimiz Xədicənin başı üzərində dayanaraq ağlayırdı. Xədicə anamız Əbu Talibin vəfat etdiyin eşitmişdi. O, xəstə halında yenə Peyğəmbərimizi təsəlli etməyə çalışırdı. Peyğəmbərimiz isə göz yaşlarına hakim ola bilmir və ağlayırdı. Əmisi üçün ağlayır, Xədicəsi üçün ağlayırdı. Bir anlığına Peyğəmbərimiz ﷺ evləndikləri ilk günləri xatırladı. Qardaşı oğlu Hakimin onlara aldığı evi, həmin evin gözəlliyini xatırladı. İndi isə Xədicəsi çadıra bənzər bir evdə həyata vəda etməyə hazırlaşırdı. Xə-

dicəsinin əllərini tutdu: **"Mənə görə, ey Xədicəm, həmişə mənə görə bu qədər sıxıntılarla qarşılaşdın. Sən hər şeyin daha yaxşısına layiqkən, mən sənə rahatlıq bəxş edə bilmədim."** - dedi. (Heysəmi, *Məcməuz-Zəvaid*, 9/218)

Peyğəmbərimiz ﷺ elə ağlayırdı ki, hıçqırıqları otaqdan kənarda da eşidilirdi. Evin digər sakinləri bir-bir otağa gəldilər. Qızları Ümmü Gülsüm, o gün on dörd-on beş yaşlarında olan Fatimə, hələ üç gün əvvəl atasını itirmiş Əli və digərləri...

Xədicə Peyğəmbərimizi təsəlli etməyə çalışır: *"Xeyr, ey bəyim! Allah mənə ən gözəlini nəsib etdi və mən bu halımdan heç zaman şikayət etmədim"* - deyirdi.



Sonra da gözlərini həyat yoldaşına dikərək: *"Mən gedirəm, ey könlümün sultanı"* - deyərək gözlərini bu dünyaya bağladı.

Bəli, dünyaya ondan erkən gəlmişdi Hz. Xədicə. Yenə Muhəmmədindən erkən bu dünyaya əlvida dedi. Xədicə erkən doğulan qız deməkdi... O, Peyğəmbərimizdən on beş il əvvəl doğulacaq, o günün qaranlıq dünyasını Muhəmmədi ﷺ üçün hazırlayacaq, aydınladacaqdı. O, hər kəsdən əvvəl iman dairəsinə girəcək, hər kəsdən əvvəl malını, sərvətini İslam uğrunda xərcləyəcək, hər kəsdən əvvəl Hz. Peyğəmbərin arxasında namaza duracaqdı. İndi hər kəsdən əvvəl, yoluna baş qoyduğu həyat yoldaşı və rəhbəri olan Muhəmmədindən əvvəl bu aləmə əlvida deyəcəkdi.

Arxada Muhəmmədi ﷺ boynu bükük buraxaraq… Peyğəmbərimiz sanki göz yaşları ilə Xədicəsini yumuş və o gün *Hacun* deyə adlandırılan, bu gün isə *Cənnətul-Mualla* deyə bilinən, Kəbəyə 2 km uzaqlıqdakı qəbiristanlığa dəfn etmişdi. Peyğəmbərimiz iyirmi beş illik həyat yoldaşını, o gün cənazə namazı hələ əmr edilmədiyi üçün axirətə dualarla yola salmışdı. Xədicə anamız Ramazanın 27-ci gecəsi vəfat etmişdi. Bir Qədr gecəsi Peyğəmbərimizə nazil olan vəhyi qəbul edərək iman dairəsinin ilk halqasına girmiş, iman ilə yenidən doğulmuş və indi də yeni bir Qədr gecəsi günü qəbir aləminə doğru getmişdi.

Artıq Peyğəmbərimiz ﷺ üçün on üç il davam edəcək Xədicəsiz bir həyat başlayırdı. Bu həyat bəlkə də Xədicəsiz idi, amma həqiqətdə də Xədicəsiz idimi?



Allah Rəsulu ﷺ xanımının, yar və yardımçısının ayrılığına çox üzülürdü. Bu günlər Peyğəmbərimizin həyatında ən kədərli və hüznlü günlər idi. Ammar b. Yasir belə rəvayət edir: *"Peyğəmbərimiz bu günlərdə elə kədərlənirdi ki, biz öz aramızda Peyğəmbərimizin başına bir iş gəlməsindən qorxur, xəstələnəcək deyə narahat olurduq."*

Yenə səhabə xanımlardan olan Osman b. Mazunun xanımı Xavlə binti Hakim deyir:

"*Xədicə anamızın vəfatının üzərindən iki ay keçmişdi. Mən Allah Rəsulunun ﷺ yanına getdim. Bir də gördüm ki, Rəsulallah göz yaşları içərisində ağlayır. Dedim ki: "Ya Rəsulallah! Artıq evlənsəniz olmazmı?"* Mənə baxdı və göz yaşları içərisində: **"Xə-**

**dicəmin acısı ürəyimdə təzə ikən mən necə evlənə bilərəm!"** - dedi." (İbn Sad, *Təbaqat,* c.8, s.57)

Allah Rəsulu ﷺ Hz. Xədicənin vəfatından sonra iki il boyunca evlənmədi. İki il sonra da yenə Xavlənin vasitəçiliyi ilə və əslində çox fərqli bir məqsədlə Sevda binti Zema ilə evləndi. Sevda anamız ilk müsəlmanlardan idi. Əri Səkran b. Amr ilə müsəlman olmuş, imanları üçün Həbəşistana hicrət etmişdilər. Bu iman ailəsi bir müddət Həbəşistanda qaldıqdan sonra Məkkəyə geri dönmüşdülər. Bunun üzərindən çox keçməmişdi ki, Səkran b. Amr vəfat etmiş, Sevda anamız altı uşağı ilə dul qalmışdı. Peyğəmbərimiz bu iman sahibi xanımla Xavlə anamızın israr və vasitəçiliyi ilə evlənmişdi.



Peyğəmbərimizin Xədicə anamızın vəfatından sonra üç illik Məkkə, on illik Mədinə həyatı vardır. Üç il Məkkə həyatı Allah Rəsulunun ﷺ hüznü, acını, kədəri ən üst səviyyədə yaşadığı zamanlardır. O, bir tərəfdən əmisi Əbu Talib və xanımı Xədicənin hüznünü ürəyində daşıyarkən, digər tərəfdən də risalət mübarizəsinin məsuliyyətini yerinə yetirir, bu vəzifənin icrası zamanı ortaya çıxan çətinliklərə də sinə gərməyə çalışırdı. Həmin illər, yenə Peyğəmbərimizin keçdiyi yollara tikanlar səpilir, hətta üzərinə heyvan içalatı atılırdı. Bu cür çətin günlərdə Allah Rəsulu, əmisi və Xədicənin yoxluğunu daha çox hiss edir, **"Haradasan, ey məni himayə edən əmim və haradasan, ey məni şəfqətli qolları arasına alan Xədicəm!"** - deyirdi.

Yenə belə günlərdən biri idi. Peyğəmbərimiz ﷺ Məkkənin daş qəlbli və qara üzlü adamlarının sözlü

və fiziki hücumlarına məruz qalmışdı. Atasının qızı, atasının anası, o gün on dörd-on beş yaşlarında olan Fatimə qaçaraq, anası kimi bir şəfqət ilə özünü atasının üzərinə atmış, atasının üzərinə atılan çirkabı təmizləməyə başlamışdı. Fatimə anamız bir tərəfdən çirkabları təmizləyir, digər tərəfdən də ağlayırdı. Peyğəmbərimiz o anda qızını təsəlli etmək üçün illərlə Xədicəsindən eşitdiyi cümləni təkrar edəcəkdi. Fatimə də, atası da bu cümlənin sahibini çox yaxşı tanıyırdı. Peyğəmbərimiz yaşlı gözlərlə dedi:

**"Ey gözümün nuru qızım! Məyus olma, Allah əsla atanı qəmgin etməyəcəkdir."**

Bu söz ata və qızı daha da duyğulandırmış, bir anda ikisini də Xədicənin ruhani iqliminə aparmışdı. Fatimə dedi: *"Atacan! Anam Xədicə indi haradadır?"* Peyğəmbərimiz ﷺ dedi: **"Ey atasının qızı! Anan indi cənnətdə inci, yaqut və mərcanlarla bəzədilmiş bir sarayda qonaqlamaqdadır."** (Heysəmi, *Məcməuz-Zəvaid*, 9/223). Ata və qız həm Xədicənin yoxluğuna, həm də Məkkənin iman qarşısındakı inadına göz yaşı tökürdülər.

Məkkəlilər imana qarşı bu cür mərhəmətdən uzaq bir hislə müqavimət göstərdiyi bir vaxtda Peyğəmbərimiz ﷺ, "görəsən Taifdə iman üçün imkan tapa bilərəmmi?", deyib oraya getmişdi. Lakin oranın əhalisi də Məkkənin təlqinləri ilə imana qarşı çıxmış, Aləmlərin Sultanını daş-qalaq etmişdi. Qan-rəvan içində qalan Peyğəmbərimiz özünü güclə Neynəvalı Addasın bağbanı olduğu üzüm bağçasına yetirmişdi. Sonra yenidən Məkkəyə tərəf yönəlmiş, Məkkəyə yaxın bir yerdə bir təpənin üzərində oturmuş və şəhərə

baxaraq: **"Mən indi nə cür Məkkəyə girəcəyəm? Məni himayəsinə alacaq nə əmim Əbu Talib, nə də Xədicə var!"** – demişdi.

Daha sonra Peyğəmbərimiz Süheyl b. Amra xəbər göndərib onu himayə etməsini istəmişdi. Süheyl bunu qəbul etmədikdə bu səfər Ahnəs b. Şərikə xəbər göndərmişdi. O da qəbul etmədikdə, Peyğəmbərimiz Mutim b. Adiyyə xəbər göndərmiş, Mutim himayə etməyi qəbul edərək, oğulları və qəbiləsinin mənsubları ilə Peyğəmbərimizi himayəsinə almışdı. Bəli, Peyğəmbərimiz o gün şirkin qalası olan Məkkəyə bir müşrikin himayəsi altında girirdi. (İbn Sad, *Təbaqat*, c. 1, s. 212; Tarix, *Təbəri,* c. 2, s. 231)



Əslində bu hadisə Peyğəmbərimizin ﷺ timsalında bütün risalət təbliğinin davamçılarına bir mesaj idi. Bu mesajın iki yönü var idi. Birincisi, bənzərsiz və köklü bir təvəkkül anlayışını mənimsəmək. İkincisi isə, "əgər Allah istəyərsə, dininə bir fasiqin, bir münafiqin, bir kafirin, hətta bir müşrikin əli ilə belə yardım edə bilər" həqiqətini öyrətmək.

Əbu Talib və Xədicə anamızın vəfatından sonra nazil olan surələrə baxdığımız zaman bu iki mesaja yönəlik mənaları özündə tərənnüm etdirən ayələrin çoxluğuna şahid oluruq. Ayələr sanki Peyğəmbərimizə ﷺ deyirdi: *"Ey Allahın Rəsulu! Allahdan başqa heç kimsəyə güvənmə. Kimə güvənirsənsə güvən, bir gün gələcək o ölüb gedəcək. Amma Allah əl-Hayydır; mütləq diridir. Ölməyən, bitməyən, tükənməyən, itməyən, yox olmayan, batmayan, xəyanət etməyən, yarı yolda qoymayan tək bir güc var. O da əl-Hayy olan Allahdır."*

Allah, elçisi Muhəmmədə ﷺ məhz bunu öyrətmək istəyirdi və sanki deyirdi: *“Ey Rəsulum! Atan İbrahim kimi ol və batanlara, gözdən itənlərə deyil, davamlı var olan Mənə bel bağla. Sən Mənə güvən, yəni təvəkkül et və əlindən gələni et, qalanını isə mənə həvalə et. Mən sənin dəvətinə qulaq asacaq ola bilsin cin tayfasını, ola bilsin Neynəvalı Addası, ola bilsin ağlından belə keçirtmədiyin Yəsrib xalqını göndərəcəyəm. “Məni kim himayə edəcək” deyə narahat olduğun zaman da, heç ummadığın və gözləmədiyin biri olan müşrik Mutim b. Adiyyi sənə göndərəcəyəm. O halda, ey Rəsulum! Allaha güvən, Allah de, yeri get, o zaman dağların nə cür qarşında düzənlik olacağını görəcəksən. Allah de, irəlilə, o zaman nə qədər qara qəlbli insanların iman edəcəyinə şahid olacaqsan. Allah de, addımla, o zaman bu şəhərdən belə eşidə bilmədiyin Kəlmeyi-Tövhidi, bütün aləmdən eşidəcəksən.”*



Allah Rəsulu ﷺ o çətin Məkkə illərindən sonra Mədinəyə hicrət etmişdi. Hicrətin üzərindən iki il keçdikdən sonra da, iman ilə inkarın ilk qarşılaşması üçün Bədrə gəlmişdi. Bədr döyüşü imanın qələbəsi ilə nəticələnmiş, müsəlmanlar qarşı tərəfdən yetmiş nəfəri öldürmüş, yetmiş nəfər də əsir almışdı. Əsirlər arasında Peyğəmbərin kürəkəni, Zeynəb anamızın iman etməmiş əri Əbul As da var idi. Zeynəb həyat yoldaşını xilas etmək üçün toy günü anası Xədicənin öz boynundan çıxarıb, qızının boynuna taxdığı boyunbağını fidyə olaraq atasına göndərir. Gələn elçi əlindəki boyunbağını Allah Rəsulunun önünə qoyur. Bu vaxt Peyğəmbərimizin gözündə xatirələr canlanır və o an, Xədicənin mənəvi iqliminə daxil

olur. Gözləri dolur və **"Bu, Xədicənin boyunbağısıdır!"** - deyir. Səhabələr də göz yaşlarına qərq olmuşdu. Onlar da kədərlənmiş, gələn boyunbağının Peyğəmbərimizə bəzi xatirələri xatırlatmasına hüznlənmişdilər. Peyğəmbərimiz ﷺ yaşlı gözlərlə: **"Bu boyunbağını Zeynəbimə geri qaytarsanız, ərini də azad etsəniz olarmı?"** - dedi. Səhabələr bu tələb qarşısında necə yox deyə bilərdi ki?! Dərhal "baş üstə" deyildi və bu əmr yerinə yetirildi. (İbn Hişam, *Sirə*, c. 2,s. 308; Əhməd b. Hənbəl, *Müsnəd*, 6/276)

Səhabələr həmin gün Peyğəmbərimizin ﷺ Xədicəyə olan sevgisinə bir daha şahid olmuşdu. Bu necə sevgidir, ya Rəbb?! İlk günkü kimi təzə və canlı.



Xədicənin vəfatının üzərindən on bir il keçmişdi. Bir vaxtlar vətənlərindən qovulub çıxarılan müsəlmanlar, indi zorla çıxarıldıqları şəhəri fəth etmək üçün Məkkəyə gəlmişdilər. Allah Rəsulu ﷺ on min əsgərlə Kəbəyə tərəf gedirdi. Bir anda Peyğəmbərimiz ordudan ayrılaraq Hacun qəbiristanlığına yönəldi. Getdi və Xədicənin məzarı yanında oturdu. Gözlərində yaş, dodaqlarında dua və istiğfar... Orada bir müddət dayandı. Səhabələr orada da o eşqə heyran olmuş, onlar da Peyğəmbərimizlə birlikdə göz yaşı tökmüşdülər.

Məkkə fəth edilmiş, Kəbə bütlərdən təmizlənmiş, Məkkənin səmalarında artıq bir daha susmamaq üzrə Azanı-Muhəmmədi səslənirdi. Allah Rəsulu Kəbənin həyətində dayanaraq gələn yüzlərlə məsələyə çarələr axtarmağa başlamışdı. Həmin an Allah Rəsulu ﷺ qoca, beli bükülmüş, əli əsalı bir yaşlı xanımın ona tərəf gəldiyini görmüşdü. Ora-

dakılara səslənərək: **"Açın yolu, gələn xanıma yol verin."** - demişdi. Əmr yerinə yetirilmiş, yollar açılmış, yaşlı xanım asta-asta Allah Rəsulunun hüzuruna gəlmiş, Peyğəmbərimiz ﷺ kürəyindəki əbanı çıxarıb yerə sərmiş və bu xanımı yanında oturdaraq, onunla söhbət etməyə başlamışdı. Allah Rəsulu bu yaşlı xanım ilə o qədər səmimi şəkildə söhbət edirdi ki, bütün səhabələr həyəcanla qadının kim olduğu ilə maraqlanırdılar. Peyğəmbərimiz gah gülür, gah kövrəlib ağlayır, gah da heç danışmadan baxışlarını ondan çəkmirdi.

Bir müddət sonra yaşlı xanım getdi. Aişə (radiyallahu anhə) böyük maraq ilə Peyğəmbərimizin yanına gəldi: *"Ya Rəsulallah! Bir az əvvəl yanınızdakı yaşlı qadın kim idi? Onunla nə danışırdınız?"* - deyə sordu. Allah Rəsulu ﷺ: **"Ey Hümeyram! Gələn Xədicənin rəfiqəsi idi. Onunla Xədicəli günləri zehnimizdə canlandırdıq."** - dedi. (Diməşqi, *Subul-əl-Huda*, c.11, s.178)



Peyğəmbərimiz gələn qadının adını çəkmir, ancaq böyük ehtimal ki, həmin qadın evliliklərinə vəsilə olan Nəfisə binti Münyə idi.

Aişə anamız (radiyallahu anhə) dözə bilməz və deyər: *"Ya Rəsulallah! Nə üçün həmişə "Xədicə, Xədicə" deyib durursan? Allah ondan daha xeyirlisini və gəncini sənə nəsib etdiyi halda sən yenə də həmişə "Xədicə, Xədicə" deyirsən."* Bir anda Peyğəmbərimizin ﷺ mübarək üzünün rəngi dəyişir, qəzəblənir və Aişənin timsalında Xədicənin dəyərini aləmə bəyan etmək üçün belə deyir: **"Xeyr! Vallahi, Allah Xədicədən daha xeyirlisini mənə**

**nəsib etmədi. Hər kəs məni təkzib edərkən, o məni təsdiqlədi. Hər kəs qapıları üzümə bağlayarkən, o qapısını mənə açdı. Hər kəs məni malından məhrum edərkən, o malı ilə, mülkü ilə bu risaləti dəstəklədi. İndi deyin, onun kimisi varmı?"** (Əhməd b. Hənbəl, *Müsnəd*, 6/117)

Vəfa abidəsi, vəfalı xanımı Xədicəni, illər sonra belə bu cür bir vəfa ilə xatırlayırdı. Aişə anamız Peyğəmbərimizin nəzərində Xədicənin qiymətini çox yaxşı anlamışdı, ancaq yenə də qısqanmadan dayana bilmirdi. Buxaridə keçən bir rəvayətdə bunu açıq şəkildə söyləyir və deyirdi: *"Onunla eyni zamanda yaşamasam da Xədicəyə qısqandığım qədər Peyğəmbərimizi heç bir qadından qısqanmadım. Çünki Peyğəmbərimiz Xədicəni o qədər xatırlayırdı ki, bir an olsun onu untumurdu. Nə zaman evimizdə bir qoyun və ya keçi kəsilsə, dərhal bir parçasını ayırar,* **"Bu pay Xədicənin qohumlarının və rəfiqələrinindir"** - deyərək onlara göndərərdi. Bir gün dözə bilmədim, Peyğəmbərimizə bu sevginin səbəbini sordum. Peyğəmbərimiz dedi: **"Ey Aişə! Mən, ən çox Xədicəni sevirəm. Sevən, sevdiklərinin sevdiyini də sevər."** (Buxari, *Mənakibul-Ənsar*, 19, 21)



Vəfanı vəfa sultanından öyrənməyə davam edək: Peyğəmbərimiz ﷺ bir gün yolda yaşlı bir xanım gördü, onu görən kimi o qədər sevindi ki, dərhal yanında oturtdu, onunla söhbət etməyə başladı və sonra da ona hədiyyələr verərək yola saldı. Bu mənzərəni görən səhabələr həmin xanımın kim olduğu ilə maraqlanmışdılar. İçlərindən biri sormuşdu: "Ya Rəsulallah! Sizi bu qədər sevindirən o xanım kim

idi?" Peyğəmbərimiz ﷺ dedi: **"O Ümmü Züfərdir. Məkkədə evimizə gələr, Xədicənin saçlarını düzəldər, onu bəzəyərdi."** (İbn Həcər, *əl-İsabə*, c. 4, s. 2696; İbn Əsir, *Üsdul-Ğabə*, s. 7, s. 322)

Hz. Xədicəyə aid hər xatirə Peyğəmərimizi ﷺ bu cür həyəcanlandırır, illər əvvəl Məkkədə evlərinə gəlib Xədicə anamızın saçlarını düzəldən bir xanımı belə unutmur, sevgilinin xatirinə o da vəfa sultanından ikram görürdü.

Bir gün o xoşbəxt evin həyətindən bir nəfər içəriyə girmək üçün izn istədi. Həmin an Allah Rəsulu Aişənin otağında idi. Peyğəmbərimiz ﷺ həyətdən izn istəyən şəxsin səsini eşidən kimi dərhal ayağa qalxdı: **"Allahım! Bu səs, evimin sultanı Xədicənin səsinə oxşayır. Şübhəsiz ki, gələn Xədicənin bacısı Halədir. Allahım! Nə olar, gələn Halə olsun!"** - dedi. (Buxari, *Mənakibul-Ənsar*, 3, 5; İbn Həcər, *əl-İsabə*, c. 4, s. 2652)



Gələn Halə idi. Allah Rəsulu ﷺ aradan illər keçməsinə baxmayaraq Xədicəsinin otağa girmək üçün izn istəyişini unutmamış, illər keçməsinə baxmayaraq xanımının xatirinə onun bacısından hörmət və ehtiramı əsirgəməmişdi.

Allah Rəsulu ﷺ iyirmi beş illik həyat yoldaşını, yar və yardımçısını o günün insanına da, bu günün insanına da əlini səmaya qaldıraraq belə tanıdacaqdı: **"Səmanın ən xeyirli xanımı İsanın anası Məryəmdir, yer üzünün ən xeyirli xanımı isə Xədicədir."** (Buxari, *Əhadisil-Ənbiya*, 31)

Həmçinin Peyğəmbərimiz ﷺ bir gün belə demişdir: “Bütün bəşəriyyət içində ən xeyirli xanımlar bu dörd xanımdır: **İmranın qızı Məryəm, Xuveylidin qızı Xədicə, Muhəmmədin qızı Fatimə və Fironun xanımı Asiyə.”** (Buxari, *Əhadisil-Ənbiya*, 27; Tirmizi, 3878)

Hz. Xədicə anamızın dəyər və qiymətinin nə olduğunu başa düşə bilməmiz üçün bunlar sadəcə bir neçə nümunədir... Onun dəyər və qiymətini ifadə edən hələ nə qədər fərqli rəvayətlər vardır. Bir sözlə Xədicə anamızın yaşadığı həyat “Peyğəmbər evinə nə cür sultan oluna bilər?” sualının cavabı mahiyyətindədir.

# Son Söz



Xanımlar Aləminin Sultanlarından biri olan Hz. Xədicədən bəhs etmək, sadəcə iyirmi beş illik səadət dolu bir evlilikdən bəhs etmək deyildi. Hz. Xədicə demək, altmış beş illik həyat və sonrası ilə böyük bir tarix deməkdir. Bu uzun tarixin hamısını yaza bilmək mümkündürmü?




Allah Rəsulu ﷺ onunla bərabər yaşadığı vaxt, həmişə ondan razı olmuş, vəfatının üzərindən illər keçsə də heç unutmamış, vəfalı xanımından nə cür razı olduğunu sözləri ilə bəyan etmişdir.

Xədicə anamızın həyat dəftərini burada bağlayarkən bu böyük İslam qadınından, kişi-qadın hər kəsin dərs alacağı çox nüanslar olduğunu bir daha xatırlatmaq istəyirəm.

Xədicə anamız adi bir xanım deyildi. O, sədaqətin, vəfanın, fədakarlığın, mücadilənin, sevginin bir abidəsi idi. Bu səbəblə də, onun həyatına tez-tez nəzər salmalı, ideal bir həyat yoldaşı olmaq baxımından ondan çox şey öyrənəcəyimizin idrakı içində olmalıyıq.

O, həm yar idi, həm yardımçı... O, həm sirdaş idi, həm də yoldaş... O, həm ana qucağı kimi şəfqətli, həm də bir dost kimi vəfalı idi. O, ilk olanlardan idi... Peyğəmbərimizin ﷺ yastığının ilk ortağı, ilk iman edən, ilk namaz qılan, Peyğəmbərimizə övlad bəxş edən ilk xanım idi. Hər şeyin ilki o idi. Bunun üçün də o, Xanımlar Aləminin Sultanı idi. Bu səbəbdən Peyğəmbərimizin könül taxtının sultanı idi. Ona ﷺ sultan olan, bizə də sultan olar. Ona ﷺ sevgili olan, bizim üçün də sevimli olar. Ona ﷺ xanım olan, bizə də ana olar.

Ey analar anası! Peyğəmbərimiz Hz. Muhəmmədi ﷺ şəfqətli qollarına aldığın kimi, Muhəmmədin ümməti olduğunu iddia edən günahlarla kirlənmiş olan biz övladlarını da qolların arasına alarsanmı? Əgər sən bizi qolların arasına alarsansa, bilirik ki, Aləmlərin Sultanı da sənin xatirinə bizləri qəbul edəcək.

Nə olar, bizi bundan məhrum etmə! Ey anaların anası və ey yolumuzun rəhbəri!

# İstifadə Edilən Mənbələr


**Acluni**, İsmail b. Muhəmməd, *Kəşful-Xafa və Muzilul-İlbas Ammə İştəhəra Minəl Əhadisi Alə Əlsinətin-Nəs*, Darul-Kutubil-İlmiyyə, Livan, Beyrut, 1421/2001.

**Əhməd b. Hənbəl**, *əl-Müsnəd,* əl-Məktəbətül-İslamiyyə, Livan, Beyrut, 1413/1993.

**Bəlazuri**, Əbul-Abbas Əhməd b. Yəhya b. Cabir, *Ənsabul-Əşraf,* Darul-Fikr, Livan, Beyrut, Tarixsiz.

**Beyhəqi**, *əl-Mədxal ilə Kitabis-Sünən*, Təhqiq: Muhəmməd Ziyaürrahman əl-Əzəmi, Darul-Kutubil-İlmiyyə, Livan, Beyrut, 1410/1987.

**Buxari**, Muhəmməd b. İsmail Əbu Abdullah, *əl-Camius-Səhih*, Məktəbətü ət-Təvfikiyyə, Misir, Qahirə, Tarixsiz.

**Buxari**, *əl-Camius-Səhih*, Beytul-Əfkəru əd-Dəvliyyə lin-Nəşr, Səudiyyə Ərəbistanı, Riyad, 1419/1998.

**Deyləmi**, Şiruyə b. Şəhrədar, *Firdevsül-Əxbar,* Darul-Kutubil-İlmiyyə, Livan, Beyrut, 1409/1986.

**Dimaşqi**, Muhəmməd b. Salih, *Subulul-hudə vər Rəşad fi Sirəti Xayril-İbad,* Tərcümə: Yusuf Özbek, Ocak Yayınları, İstanbul, 1424/2004.

**Diyərbəkiri**, Hüseyn b. Muhəmməd b. Həsən, *Tarixul-Xamis fi əhvəli nəfis*, Darus-Sadr, Livan, Beyrut, Tarixsiz.

**Əbu Davud**, Süleyman b. Eşas b. İshaq əl-Əzdi, əs-Sicistani, *əs Sünəni-Əbu Davud*, Darul-Fikr, Livan, Beyrut, 1414/1994.

**Əbu Nuaym**, Əhməd b. Abdullah əl-İsfəhani, *Hilyətul-Övliya və Təbaqatul-Əsfiya,* Darul-Kitəbil-Arabi, Livan, Beyrut, 1405/1981.

**Əbu Nuaym**, *Dəlailun-Nubuvvə,* Təhqiq: Muhəmməd Rəvvas Kalaci, Əbdilbərr Abbas, Darun-Nəfais, Livan, Beyrut, 1412/1991.

**Hakim**, *Mərifətu Ulumil-Hədis,* Darul-Marifə, Livan, Beyrut, Tarixsiz.

**Hakim**, Muhəmməd b. Abdullah ən-Nisaburi, *əl-Müstədrək aləs-Səhiheyn*, Darul-Kutubil İlmiyyə, Livan, Beyrut, 1411/1991.

**Hələbi**, Allamə Əbu əl-Fəza Nurəddin Əli b. İbrahim b. Əhməd, *İnsənul-Uyun fi Sirətil-Əmin əl-Məmun,* Darul-Kutubil-İlmiyyə, Livan, Beyrut, 1428/2008.

**Muhəmməd Həmidullah**, *İslam Peygambəri, (4).* Tərcümə: Salih Tuğ, İrfan Yayıncılık, İstanbul, 1993.

**Heysəmi**, Nuriddin Əli b. Əbu Bəkr, *əl-Məcməüz-Zəvaid və Mənbəul-Fəvaid,* Darul-Kutubil-İlmiyyə, Livan, Beyrut, 1408/1988.

**İbn Əbdilbərr**, Əbu Ömər Yusif b. Abdullah b. Muhəmməd əl-Qurtubi, ən-Nəməri, *əl-İstiab fi Mərifətil Əshab,* Darul-Kutubil-İlmiyyə, Livan, Beyrut, 1415/1995.

**İbn Əsir**, İzzuddin Əbul-Həsən Əli b. Muhəmməd, Əl Cəzəri, *Üsdul-Ğabə fi Mərifətis-Səhabə,* Darul-Kutubil-İlmiyyə, Livan, Beyrut, 1424/2003.

**İbn Həbib**, Əbu Cəfər Muhəmməd, *əl-Muhabbər,* Darul-İfək əl-Ləbidiyyə, Livan, Beyrut, Tarixsiz.

**İbn Həcər**, Əl-Əsqalani Şihabüddin Əbul-Fadl Əhməd b. Əli, *əl-İsabə fi Təmyizis-Səhabə,* Darul-Marifə, Livan, Beyrut, 1425/2004.

**İbn Həcər**, *Fəthul-Bari bi Şərhi Səhihi-Buxari*, (1-16) Darul-Bəyan, Misir, Qahirə, 1419/1999.

**İbn Hişam**, Əbu Muhəmməd Əbdulməlik, *əs-Sirətun-Nəbəviyyə*, Məktəbətüs-Safa, Misir, Qahirə, 1422/2001.

**İbn İshaq**, Muhəmməd b. İshaq b. Yəsar, *Sirətü İbn İshaq*, Təhqiq: Muhəmməd Həmidullah, Məhədüd-Dirasə, Tarixsiz.

**İbn Kəsir**, Əbul-Fida İmaduddin, *əl-Bidayə vən-Nihayə*, Darul-Kutubil-Maarif, Livan, Beyrut, 1406/1987.

**İbn Macə**, Muhəmməd b. Yezid əl-Qəzvini, *əs-Sünən*, Darul-Kutubil-İlmiyyə, Livan, Beyrut, 1421/2001.

**İbn Sad**, Muhəmməd, *Kitəbut-Təbaqtil-Kəbir*, Təhqiq: Əli Muhəmməd Amr, Məktəbətul-Hanimi, Misir, Qahirə, 1421/2001.

**İbn Sad**, *ət-Təbaqatil Kəbir*, Darus-Sadr, Livan, Beyrut, 1414/1994.

**İbn Sünni**, Əbu Bəkir, Əhməd b. Muhəmməd b. İshaq, əd-Dinəvəri, *Amələl-Yəvm vəl-Leylə*, əl Məktəbətül-Əzhəriyyə, Misir, Qahirə, 1420/2000.

**İbnul-Cevzi**, Əbul Fərəc Əbdurrahman, *Təlkihu Fuhum Əhlil Əsər fi Uyunit-Tarix vəs-Siyər*, Məktəbətül-Ədəb, Misir, Qahirə, 1419/1999.

**İsfəhani**, İsmail b. Muhəmməd ibnil-Fəzl ət-Teymi, *Dəlailün-Nübüvvə*, Daru Taybə, Səudiyyə Ərəbistanı, Riyad, 1409/1986.



**M.Asım Köksal**, *Hz. Muhammed ve İslamiyet*, Mekke-Medine Dönemi, (c.1-9), İrfan Yayınevi, İstanbul, 1981.

**Köksal**, *Hz. Muhammed ve İslamiyet*, (c. 1-4), Işık Yayınlar, İzmir, 2007.

**Malik b. Enes**, Əbu Abdullah, *əl-Muvatta*, Daru-İhyait-Turasil-Arabi, Misir, Qahirə, 1414/1993

**Müslim b. əl-Həccac**, *Səhihu Müslim*, Çağrı Yayınları, İstanbul 1414/1993.

**Nəsai**, Əhməd b. Şuayb Əbu Əbdurrahman, *Sünənü ən-Nəsai*, Darul-Marifə, Livan, 1422/2001.

**Nəvəvi**, Əbu Zəkəriyya Yəhya b. Şərəf b. Müri, *Riyazus-Salihin*, Tərcümə: M.Yaşar Kandemir,

İsmail Lütfi Çakan, Raşit Küçük, Erkam Yayınları, İstanbul, 1427/2006.

**Rüdani**, İmam Muhəmməd b. Muhamməd b. Süleyman, *Cəmul-Fəvaid Min Camiil-Usul və Məcmaiz-Zəvaid*, Tərcümə: Naim Erdoğan, İz Yayıncılık, Tarixsiz.

**Suyuti**, Cəlaluddin Əbdurrahman b. Əbu Bəkr, *əd-Durrul-Mənsur Fit-Təfsir Bil Məsur*, Təhqiq: Abdullah b. Əbdulmuhsin ət-Türki, Mərkəzul-Buhus və Dirəsətil-Arabiyyə, Misir, Qahirə, 1424/2003.

**Təbərani**, Əbul Qasım Süleyman b. Əhməd, *əl Mucəmül-Kəbir*, Daru İhya-i Turasil-Arabi, Livan, Beyrut, 1413/1993.

**Təbəri**, Əbu Cəfər Muhəmməd b. Cərir, *Tarixul Ümməm vəl Mülük*, Darul-Kutubil-İlmiyyə, Livan, Beyrut, 1422/2001.

**Təbəri**, *Camiul-Bəyan ən Təvili Ayil-Quran*, Darul-Fikr, Livan, Beyrut, 1415/1995.

**Tirmizi**, Muhəmməd b. İsa, Əbu İsa, *Sünənüt-Tirmizi*, Darul İhya Ət-Turasil Arabi, Livan, Beyrut, 1414/1994.

**Türkiyə Diyanət Vəqfi**, *İslam Ensiklopediyası, (c.1-37)*, İstanbul, 1988.

**Vahidi**, Əbul-Həsən Əli b. Əhməd, *Əsbabun-Nüzul*, Darul-Fikr, Livan, Beyrut, 1421/2001.

**Vaqidi**, Əbu Abdullah Muhəmməd b. Ömər, *Kitabul Məğazi*, Darul-Kutubil-İlmiyyə, Livan, Beyrut, 1424/2002.

**Yəmani**, Muhəmməd Abduh, Ümmül-Müminin *Xədicətü Bintiü Xuveylid Seyyidətun fi Qəlbil-Mustafa*, Müəssəsətü Ülumil-Quran, Şam, Dəməşq, 1422/2002.

**Muhammed Emin Yıldırım**, *Hazreti Peygamberin Albümü*, Siyer Yayınları, İstanbul, 2010.

**Muhammed Emin Yıldırım**, *Nebevi Eğitim Modeli Darul-Erkam*, Siyer Yayınları, İstanbul, 2010.

**Muhammed Emin Yıldırım**, *Sahabeyi Nasıl Anlamalıyız?* Siyer Yayınları, İstanbul 2010.

**Zəhəbi**, Əbu Abdullah Muhəmməd b. Əhməd b. Osman, *Siyər Aləmin-Nübəla*, Darul-Hədis, Misir, Qahirə, 1427/2006.

**Zəhəbi**, *Təcridu Əsmais-Səhabə*, Darul-Bəyan, Misir, Qahirə, 1406/1987



# Cədvəl və Rəsmlər



- Hz. Xədicənin Şəxsiyyət Cədvəli
- Hz. Xədicənin Ailəsi
- Hz. Xədicənin Soy-Kökü
- Hz. Xədicənin Qəbrinin Şəkilləri



خديجة بنت خويلد

| | |
|---|---|
| Adı: | Xədicə binti Xuveylid |
| Mənası: | Erkən doğulan qız uşağı |
| Künyəsi/Ləqəbi: | Ümmül-Qasım/Qasımın anası<br>Ümmül-Hind/Hindin anası<br>Kübra/Uca<br>Tahirə/Təmiz |
| Qəbiləsi: | Əsədoğulları/Məkkə |
| Soy yaxınlığı: | Ata tərəfdən 5-ci göbəkdə, ana tərəfdən 9-cu göbəkdə soyu birləşir. |
| Qohumları: | Məşhur səhabələrdən Zübeyr b. Avvam ilə Hakim b. Hizamın bibisidir. Amr b. Əsəd əmisi, Varaqa b. Növfəl isə atasının əmisi oğludur. |
| Fiziki xüsusiiyətləri: | İki dəfə dul qalmasına və o günə qədər üç uşaq dünyaya gətirməsinə baxmayaraq, o qədər gözəl idi ki, Məkkənin bütün qəbilələrindən imkanlı ailələrin övladları qapısında evlənmək üçün növbəyə düzülürdülər. |
| Xarakteri: | Cəsarəti, vəfası, vüqarı, fədakarlığı və mərhəməti ilə zirvədə olan bir qadın idi. |
| Təvəllüdü: | Miladi, 555/ Nübüvvətdən 55 il əvvəl |
| Doğulduğu yer: | Məkkə |
| Atasının adı: | Xuveylid b. Əsəd |
| Nənəsinin adı: | Zöhrə binti Amr b. Həbtər b. Rüveybə b. Hi lal |
| Babasının adı: | Əsəd b. Əbduluzza b. Qusay |
| Anasının adı: | Fatimə binti Zaidə |
| Nənəsinin adı: | Halə binti Əbdulmənaf b. Haris |
| Babasının adı: | Zaidə b. əl-Asam b. Hacər b. Mais |
| Qardaş və bacıları: | Avvam, Növfəl, Hizam, Halə və Ruqiyyə |
| Əvvəlki evlilikləri: | İki evliliyi olmuşdur. |
| Ərlərinin adı: | Əbu Halə/ Malik b. Nəbbaş və Atiq b. Aiz |

| | |
|---|---|
| Evlilik tarixi: | Nübüvvətdən 15 il əvvəl |
| Mehri: | 12 Uqiyyə |
| Evlilik yaşı: | 40 |
| Evli qaldığı müddət: | 15 il Nübüvvətdən əvvəl, 10 il Nübüvvətdən sonra. Cəmi 25 il. |
| Oğlanları: | Hind b. Əbu Halə, Haris b. Əbu Halə, Qasım, Abdullah |
| Qızları: | Hind binti Aiz, Zeynəb, Ruqiyyə, Ümmü Gülsüm, Fatimə |
| Vəfat tarixi: | Miladi 19 Aprel 620 Nübüvvətin 10-cu ili 27 Ramazan |
| Vəfat yaşı: | 65 |
| Vəfat yeri: | Cənnətül-Mualla/Məkkə |
| Vəfat səbəbi: | Xəstəlik |
| Rəvayət etdiyi hədis sayı: | 1 |
| Ondan hədis həvayət edənlər: | Hz. Aişə |

## Xüsusiyyətləri

Xədicə anamızın xüsusiyyətlərini saymağa səhifələr kifayət etməz. Çünki o, iffətsiz bir dövrün Məryəmi, Fironları çox olan bir bölgənin Asiyəsi, vəhyə analıq edib varlığını bu yola həsr edən Həcəri və Peyğəmbərimizin ﷺ həyat yoldaşıdır. O, bir vəfa abidəsi və fədakarlıq qəhrəmanıdır.

## Haqqında deyilənlər

Peyğəmbərimiz (sallallahu aleyhi və səlləm) onlarla sözü ilə Xədicə anamızın dəyər və qiymətini bizə bildirmişdir. O (sallallahu aleyhi və səlləm), bir ömür boyu onu unutmamış, vəfatından sonra da hər dəfə ondan bəhs etmişdir. Elə buna görə də Aişə anamız bir gün belə deyəcəkdi: "Xədicə ilə eyni zamanda yaşamasam da, mən ən çox onu qısqanmışam." Məhz bunun səbəbi də Peyğəmbərimizin (sallallahu aleyhi və səlləm) Xədicə anamızı heç unutmamasıdır. Hətta bir gün Aişə anamız dözə bilməyib: "Ya Rəsulallah! Allah sənə daha yaxşısını, gəncini və xeyirlisini nəsib etdiyi halda sən yenə də Xədicə, Xədicə deyirsən!" - demişdi. Bir anda Peyğəmbərimizin (sallallahu aleyhi və səlləm) mübarək üzünün rəngi dəyişir, qəzəblənir və Aişənin timsalında Xədicənin dəyərini aləmə bəyan etmək üçün belə deyir: *"Xeyr! Vallahi, Allah Xədicədən daha xeyirlisini mənə nəsib etmədi. Hər kəs məni təkzib edərkən, o məni təsdiqlədi. Hər kəs qapıları üzümə bağlayarkən, o qapısını mənə açdı. Hər kəs məni malından məhrum edərkən, o malı ilə, mülkü ilə bu risaləti dəstəklədi. İndi deyin, onun kimisi varmı?"* (Əhməd b. Hənbəl, Müsnəd, 6/117)

# Hz. Xədicənin Ailəsi

Xədicə Binti Xuveylid — Əbu Halə (Malik b. Nəbbaş b. Əbu Zürarə)

- Hind
- Haris

Xədicə Binti Xuveylid — Atiq b. Aiz

- Hind Bint Aiz — Sayfi b. Ümeyyə
  - Muhamməd
    - Bəni Tahirə

Xədicə Binti Xuveylid — Muhamməd b. Abdullah ﷺ

- Zeynəb
- Ruqiyyə
- Ümmü Gülsüm
- Fatimə
- Qasım
- Abdullah

# Hz. Xədicənin Soy-Kökü





*Cənnətul-Muallanın və Hz. Xədicənin qəbrinin tarixi bir görünüşü*




*Hz. Xədicənin qəbrinin şəkli*



*Hz. Xədicənin qəbrinin nisbətən qədim şəkli*
*Məkkə*